*Mən aşıq bilən bizi,*
*Tutubdu bilən bizi.*
*Dardayıq, unutmasın*
*Tanıyan, bilən bizi.*
**Sarı Aşıq**



**№1(1)**
**May 2011**

**Bakı – 2011**

**Laçın yurdu, №1(1), 2011**
**Bakı, “Elm və təhsil”, 2011. 136 səh.**



Redaksiyanın ünvanı:
**Sabit Rəhman 7**

Əlaqə:
**Tel.: (070) 956 36 22, (050/055) 362 03 60**
**e-mail: lachinyurdu@mail.ru**

Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.
VÖEN:1401771462

# BU SAYIMIZDA

***İdmançılarımız***



***Sənətçilərimiz***



***Poeziya***



***Ədəbi gənclik***



***Ədəbi düşüncə***



***Kitab rəfi***



## BAŞ REDAKTORDAN

Əziz oxucular, bilirəm ki, "heç kimin kitabını heç kim oxumur" fikrinin aktual olduğu dövrdə yeni yaranan hər hansı bir nəşri sevdirmək və yaşatmaq o qədər də asan deyil. Onu da bilirəm ki, yüzlərlə qəzet-jurnalın dərc edildiyi ölkədə gəlirli bir işin qulpundan yapışmaq əvəzinə işğala məruz qalan bir bölgənin adını daşıyan jurnal çıxarmaq istəyimizə görə bizi qınayanlar da tapılacaq. Təbii ki, mətbu orqanın işıq üzü görməsi üçün həm də xeyli vəsait lazımdır və həmin vəsait bizdə yoxdur. Onda haqlı sual meydana çıxır: - Bəs biz nəyə arxalanırıq? Ən azı ilk mərhələdə on minlərin arasında mətbuatın cəmiyyətə təsir imkanlarını qiymətləndirməyi bacaran təxminən 500 nəfərin bizi anlayacağına, jurnalımıza abunə yazılacağına inanırıq. Ümidvarıq ki, zaman keçdikcə mövqeyimizi bölüşənlərin hesabına abunəçilərimizin sayı artacaq.

"Laçın yurdu" jurnalını oxucuların ixtiyarına verməkdə məqsədimiz respublikamızın digər regionları ilə müqayisədə mətbuatla əlaqələri çox zəif olan Laçın rayonunun ictimai-mədəni, sosial problemlərini işıqlandırmaq, şair və yazıçılarına, alimlərinə, sənətçilərinə, Qarabağ müharibəsində böyük rəşadət göstərən qəhrəman oğullarına, cəfakeş müəllimlərinə, həkimlərinə, iş adamlarına, bir sözlə istedadı və xeyirxahlığı ilə seçilən hər kəsə geniş yer ayırmaq, onları ictimaiyyətə daha yaxından tanıtmaqdır.

Dediklərimiz yanlış başa düşülməməlidir. Biz həmişə regionçuluğun, bölgəçiliyin əleyhinəyik. Ancaq bir həqiqəti də unutmamalıyıq ki, kəndini, rayonunu sevməyən bütövlükdə Vətənini sevə bilməz. Fiziki cəhətdən itirdiyimiz doğma yurdumuzun adını mənəvi paytaxtımıza çevirməyi bacarmalıyıq. Bu gün Laçında doğulmayan laçınlıların artıq 18 yaşı tamam olub. Necə deyərlər, Laçını görməyən oğlan uşağının əsgərlik yaşı çatıb. Dünyagörüşü hələ tam formalaşmayan gənclərimizin, körpə balalarımızın genetik yaddaşını qorumaq ümdə vəzifəmizdir.

Bundan ötrü təsəvvürümüzdə, göz yaddaşımızda, xatirəmizdə yaşayan Laçınla bağlı bütün təəssüratlarımızı gənc nəslə mütləq çatdırmalıyıq. Ona görə də unutqanlığımıza qarşı mübarizə aparmağı qarşısına məqsəd qoyan hər kəsi yaşından, tutduğu vəzifədən, siyasi mənsubiyyətindən asılı olmayaraq bizimlə əməkdaşlığa çağırırıq. Ürəyinizdən keçənləri, arzu və istəklərinizi yazın. Problemlərinizdən, sizi narahat edən məsələlərdən söhbət açın. İnsanlara qayğı göstərməkdən zövq alan, yaxşılığı özünə amal seçən soydaşlarımızdan, idarə və müəssisələrdə vətəndaşları

incitməyən, vəzifə borclarını təmənnasız yerinə yetirən dövlət qulluqçularından yazmağı da unutmayın. Çünki belə şəxslərin adlarını məmnunluqla sadalamaq yalnız öz mənafeyini düşünənlərə, bədxahlara, adi bir sənədi hazırlayarkən nəsə umanlara ən tutarlı cavabdır.

İstəkli oxucular, xoş məramlarla görüşünüzə gəlmişik. Güvənc yerimiz təkcə sizsiniz.

Biz ayrı-ayrı imkanlı şəxslərə ağız açıb müəyyən məbləğ müqabilində gözü kölgəli olmaq istəmirik, kimlərinsə minnətini götürüb onların diktəsi ilə yazmağı mənliyimizə sığışdırmırıq. Qarşınızda həmişə üzüağ, alnıaçıq dayanmaq yolunu seçmişik. Bizimlə birlikdə bu yolu seçənlərə salam olsun!

## VƏZİFƏ GƏLDİ-GEDƏRDİ

Məsul vəzifələrdə çalışan laçınlılara qısa xatırlatma: "İnsan vəzifədə tanınar" - deyiblər. Amma vəzifədə axıracan ləyaqətlə duruş gətirmək hamıya nəsib olmur. Heç vaxt səlahiyyətinizlə öyünməyin, 3-5 il çalışdığınız vəzifədə imkanınız daxilində insanlara edə bildikləriniz yaxşılıqlarla qürur duyun. Elə işləyin ki, vəzifədən çıxandan sonra hamının gözünə dik baxmağa cürətiniz çatsın. Vicdanınız qarşısında xəcalət çəkməyəsiniz.

## TƏBRİK

**Kəsərli qələm arzulayıram!**



Eşidəndə ki, "Laçın yurdu" adlı dərgi həyat vəsiqəsi almağa hazırlaşır, bu xəbərdən çox sevindim və təsirləndim. Düşündüm ki, Vətən sevgisini, Laçın dərdini içində çəkən, onun səsinə səs verməyə hazır olan ərən oğullarımız ayaq üstədir.

Əziz dostlar, bu gün işğal altında qalan Laçınımızın və ona qonşu ərazilərimizin ağrı-acısını açıb demək, dünyaya çatdırmaq üçün belə bir mətbu orqana ehtiyac duyulmaqdadır.

Mən ümidvaram ki, bu dərgidən Laçın torpağının harayı, Laçın təbiətinin, gülünün, çiçəyinin ətri, Laçın igidlərinin nərəsi gələcək...

Əziz həmkarlarım, sizə başladığınız bu müqəddəs və şərəfli işdə kəsərli qələm və uğurlu yaradıcılıq cəsarəti arzulayıram.

**Eldar İSMAYIL,**
***şair-yazıçı***

**TARİXİ KİMLİYİMİZ**



## XALQ QƏHRƏMANI SULTAN BƏY - 140

Son illər Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı ilə zəngin tarixi keçmişimizin araşdırılması nəticəsində nəşr olunan əsərlər, tariximizin qaranlıq səhifələrinin yenidən öyrənilməsi, milli varlığımıza qayıdış hər bir Azərbaycan vətəndaşının ürəyincədir. Xüsusilə xalqımızın totalitar-sovet rejimindən azad olduğu son 20 ilə yaxın bir dövr ərzində bir çox milli qəhrəmanlarımızın xalq arasındakı nüfuz və xidmətlərinin yenidən öyrənilməsi və təbliği, ölkəmizin qəsdən cəlb edildiyi Qarabağ müharibəsi dövründə olduqca əhəmiyyətlidir.

Belə xalq qəhrəmanlarından biri də XIX əsrin sonu XX əsrin əvvəllərində Zəngəzur bölgəsində öz sücaəti, mərdliyi və igidliyi ilə xalq arasında böyük hörmətə və nüfuza malik olan Sultan bəy Sultanov olmuşdur.

Sultan bəy 1871-ci ildə Zəngəzur qəzasının Qasımuşağı obasında (hazırda Laçın rayonunun Kürdhacı kəndində) anadan olmuşdur. Sultan bəy ibtidai təhsil aldıqdan sonra Gəncə şəhərində gimnaziyada orta təhsilini tamamlayaraq, o dövrün ən mükəmməl məktəblərindən olan Sankt-Peterburq Hərbi Akademiyasına daxil olmuşdur. Lakin, naməlum səbəblərə görə məktəbi bitirməmiş və o, anadan olduğu doğma kəndinə qayıtmışdır.

Sultan bəyin milli qəhrəman kimi xalq arasında ad qazanması 1905-1906-cı illər erməni-müsəlman hadisələri ilə başlayır. Özünün qorxmazlığı və cəsarəti ilə tez bir zamanda bölgənin igid oğullarını ətrafına toplayan Sultan bəy həmin dövrdə yağı düşmənin geri oturdulmasında xüsusi rol oynayır.

Təkcə bir faktla 1905-1906-cı və 1918-1919-cu illər erməni-müsəlman hadisələrində Sultan bəyin necə bir sücaət göstərdiyini aydın görmək olar.

1919-cu ilin fevral ayında Sultan bəyin rəhbərlik etdiyi silahlı dəstələr Laçının Zabux dərəsində erməni generalı, müsəlmanların qatı düşməni Andronikin təxminən 30 minlik daşnak ordusunu darmadağın etmiş, bununla da Andronikin Qarabağı, sonra isə Gəncəni tutaraq S.Şaumyanın bolşevik-daşnak hərbi hissələri ilə birləşərək Şimali Azərbaycanda erməni hakimiyyəti qurmaq planını alt-üst etmişdir. Bundan sonra həmin dərə orada gedən döyüşlərdəki qırğının miqyasına görə xalq arasında «Qanlı dərə» adlandırılmışdır.

Sultan bəy və onun qardaşı - Azərbaycan Demokratik Respublikasının ilk hərbi naziri, ikinci hökumətdə əkinçilik naziri və Qarabağın general-qubernatoru olmuş Xosrov bəy Sultanovun yalnız Zəngəzur və Qarabağ deyil, Kəlbəcər, Basarkeçər və digər ərazilərimizin də erməni quldurlarından qorunmasında əvəzsiz xidmətləri olmuşdur.

Hələ sağlığında əfsanəvi xalq qəhrəmanı adı qazanan Sultan bəy çox təəssüf ki, sovet hakimiyyəti qurulduqdan sonra mühacir həyatı yaşamışdır.

Mühacirət həyatının ilk illərində İranda olmuş, lakin sonralar Sovet İmperiyasının göndərdiyi casuslar tərəfindən təqib olunduğundan 1923-cü ildə Türkiyə dövlətinə keçmişdir. Sultan bəy 1955-ci ildə Türkiyədə Qars vilayətinin Köçqoy kəndində vəvat etmişdir. Sultan bəy mühacirətdə olarkən ailəsi müsibətlərlə qarşılaşmış, 1937-ci ildə həyat yoldaşı, 3 oğlu və bir qızı Qazaxıstana sürgün edilmişdir. Onlar 1956-cı ilədək sürgün həyatı yaşamışlar.

Uzun illər totalitar - sovet rejimi dövründə neçə-neçə qəhrəmanlarımızla bərabər fəaliyyətinin öyrənilməsi yasaq edilən Sultan bəy və qardaşı Xosrov bəy haqqında geniş tədqiqat işi və araşdırma aparılmamışdır. Azərbaycan Dövlət Arxivində və yazılı ədəbiyyatda məlum səbəblərdən Sultan bəy haqqında geniş materiala rast gəlinmir. Əldə olunan materiallar daha çox yaşlı nəslin söhbətləri və qeydləri əsasında toplanılmışdır.

Hələ 1996-cı ildə ulu öndərimiz Heydər Əliyev Laçın və Şuşa ictimaiyyətinin nümayəndələri ilə görüşü zamanı Sultan bəyin fəaliyyətini yüksək qiymətləndirərək, onun dövrünün cəsur bir qəhrəmanı olduğunu xüsusilə vurğulamışdır.

2011-ci ildə Sultan bəyin anadan olmasının 140-cı ili tamam olur. Bu gün torpağımızın 20 faizə qədərinin erməni işğalı altında olduğu bir

vaxtda gənclərimiz üçün əsl qəhrəmanlıq məktəbi olan belə qəhrəmanların həyat və fəaliyyətlərinin öyrənilməsi və təbliği xüsusilə vacibdir.

Sultan bəyin yubileyinin təntənəli surətdə keçirilməsi ilə əlaqədar rayonun bir qrup ağsaqqal və ziyalısının təşəbbüsünü nəzərə alaraq Laçın Rayon İcra Hakimiyyətinin başçısı Ramiz Cəbrayılov «Sultan bəyin anadan olmasının 140 illik yubileyinin qeyd edilməsi haqqında» 01 dekabr 2010-cu il tarixli 80 №li Sərəncam qəbul etmişdir. Həmin Sərəncamla yubileyin keçirilməsi ilə əlaqədar təşkilat komitəsi yaradılmışdır. Təşkilat Komitəsi tərəfindən tədbirlər planı hazırlanmışdır. Tədbirlər planına uyğun olaraq Azərbaycan Texniki Universitetinin «Tarix» kafedrasının müdiri, tarix elmləri doktoru, professor Şikar Qasımov tərəfindən Sultan bəy və qardaşı Xosrov bəyin həyat və fəaliyyəti ilə bağlı arxiv materiallarının toplanması, tədqiqat və araşdırmalar aparılması işinə başlanılmışdır. Artıq bu materiallar əsasında Ş.Qasımov Sultan bəy haqqında kitabın üzərində işləyir. Sultan bəyin həyat və fəaliyyətindən bəhs edən film üzərində də iş gedir.

2010-cu ilin dekabr ayından kütləvi informasiya vasitələrində Sultan bəy haqqında materiallar verilir. Artıq «Azərbaycan», «Xalq qəzeti» və «Laçın» qəzetində bununla bağlı geniş məqalələr verilmişdir. «Laçın» qəzetində «Sultan bəy – 140» rubrikası açılmışdır.

Bu ilin yanvar ayının 29-da rayon icra hakimiyyətində rayon ziyalılarının, Sultan bəyin qohumlarının və əlaqədar təşkilatların nümayəndələrinin iştirakı ilə «Dəyirmi masa» keçirilmişdir. Burada təşkilat komitəsi tərəfindən tədbirlər planında nəzərdə tutulmuş məsələlərin icrası vəziyyəti, Sultan bəyin 140 illik yubileyi ilə əlaqədar görüləcək işlər bir daha müzakirə edilmiş, rəy və təkliflər dinlənilmişdir. «Dəyirmi masa»da irəli sürülən bir çox təkliflər tədbirlər planına əlavə olunmuşdur. Bu təkliflərdən Sultan bəyin adının əbədiləşdirilməsi, Türkiyədə olan qəbrinin abadlaşdırılması, hərbi sahədə müvəffəqiyyətlərə görə «Sultan bəy» adına mükafatın təsis edilməsi, Sultan bəyin anadan olduğu kəndə onun adının verilməsi və s. göstərmək olar.

**Bəsti NƏCƏFLİ,**
***Laçın Rayon İcra Hakimiyyəti başçısının təhsil, səhiyyə və mədəniyyət üzrə müavini, təşkilat komitəsinin sədri***

## İLK HƏRBİ NAZİR



Xosrov bəy Sultanov 1879-cu il may ayının 10-da Zəngəzur qəzasının Hacısamlı nahiyəsinin Kürdhacı (Qasımuşağı obasında) kəndində (indiki Laçın rayonu) dünyaya göz açmışdır. Gəncə gimnaziyasını bitirdikdən sonra Odessada ali tibb təhsili almışdır.

1918-ci ilin 28 mayında Tiflisdə Azərbaycan Milli Şurası adından Azərbaycan Xalq Cümhuriyyətinin elan edilməsi Bəyannaməsinə imza edən 26 nəfərdən biri də Xosrov bəy Sultanov olmuşdur. Xalq Cümhuriyyətinin həmin gün təşkil edilmiş birinci hökumət kabinetində Xosrov bəy Hərbi Nazir postunu tutmuşdur. O, Zaqafqaziya seyminin və Azərbaycan parlamentinin üzvü olmuşdur.

Xosrov bəy Sultanov 1919-cu ilin 15 yanvarında Qarabağın general-qubernatoru təyin olunmuşdur. Həmin ilin 21 martında erməni-daşnak hərbi dəstələri Qarabağa yeganə keçid olan Əsgəran keçidini zəbt etmişlər. Amma daşnak generalı Dronun hərbi dəstələri Xosrov bəyin başçılıq etdiyi Azərbaycan əsgərləri tərəfindən mayın 30-da darmadağın edilmiş, Xankəndi və Şuşa geri alınmışdır.

1923-cü ildən general Xosrov bəy Sultanovun həyatında mühacirət dövrü başlanmışdır. O, Türkiyədə, İranda (1926), daha sonra Fransa və Almaniyada yaşamış, Almaniyada Tibb Universitetində professor vəzifəsində çalışmışdır. Bundan sonra, 1936-cı ildə Türkiyəyə qayıdan Xosrov bəy Sultanov Trabzonda məskunlaşmışdır. Xosrov bəy 1947-ci ildə vəfat etmişdir.



## MAARİF VƏ DİNİ ETİQAD NAZİRİ

*Nurməmməd bəy Adilxan bəy oğlu Şahsuvarov - (1883, Laçın - 11 avqust 1958, Bakı), AXC-nin, Dağıstanın maarif naziri, Azərbaycanın istiqlal hərəkatı və Azərbaycan Xalq Cümhuriyyəti dövlət xadimlərindən biri, maarifçi.*

Nurməmməd bəy Adilxan bəy oğlu 1883-cü ildə Zəngəzur qəzasının Minkənd (Şahsuvarlı) kəndində anadan olmuşdur. Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasını bitirmiş (1903), bir müddət Gəncədə rus dili müəllimi işləmişdir. Sonralar Tiflis Aleksandr Müəllimlər İnstitutunu (1915), ekstern yolu ilə Kiyev Universitetinin hüquq fakültəsini (1915) bitirmişdir. N. Şahsuvarov Rusiya Fevral İnqilabı dövründə siyasi hadisələrdə yaxından iştirak etmiş, 1918-ci ilin yayında Şimali Qafqaz xalqlarının azadlıq hərəkatının nəticəsində yaradılmış Dağlılar Respublikasının xalq maarif naziri təyin olunmuşdur.

1919-cu ilin iyununda Bakıya gələn N.Şahsuvarov Azərbaycan Xalq Cümhuriyyəti Nazirlər Şurasının sədri Nəsib bəy Yusifbəylinin birinci hökumət kabinetində (Cümhuriyyətin dördünü hökumət kabineti) maarif nazirinin müavini vəzifəsində işləmiş, Azərbaycanın şəhər və kəndlərində ana dilində məktəb və seminariyaların açılması, təhsil və mədəniyyət sahəsində bir sıra mütərəqqi tədbirlərin həyata keçirilməsində, Bakı Dövlət Universitetinin təşkilində yaxından iştirak etmişdir. "İttihad" partiyasının üzvü idi. Şahsuvarov 1920-ci il martın 5-də Nəsib bəy Yusifbəylinin ikinci hökumət kabinetində (Cümhuriyyətin beşinci hökumət kabineti) maarif və dini etiqad naziri təyin olunmuşdur. Aprel işğalından (1920) sonra N.Şahsuvarov Azərbaycan SSR xalq maarif komissarının müavini olmuş, Bakıda orta və ali təhsil ocaqlarında dərs demişdir. 1940-cı ildə saxta ittihamlarla həbs edilərək, Krasnodar diyarına sürgün edilmişdir. 1943-cü ildə sürgündən qayıdaraq, Azərbaycan Tibb İnstitutunda rus dili kafedrasının müdiri işləmişdir. O, 1958-ci ildə vəfat etmişdir.

Nurməmməd bəy Feona Kuzminşina ilə ailə həyatı qurmuşdur. Cahangir bəy adlı oğlu vardı.

## TƏBRİK



### Laçınlı günlər arzulayıram

Laçının işğal olunmasının 19-cu ilinin tamamı ərəfəsində "Laçın yurdu" adlı jurnalın işıq üzü görəcəyi xəbərini eşidəndə qəlbən çox şad oldum. Laçınsız yaşadığımız illər ötüb keçdikcə, yurd həsrəti ürəyimizə od salır.

Vətən həsrəti ilə, yurd ağrısıyla odlanan ürəyimizə sərinlik bəxş edən hər hansı bir kütləvi informasiya vasitəsinin dünyaya gəlişi, işıq üzü görməsi böyük sevinc hissi ilə qarşılanası haldır. Qan ağlayan ürəyimə toxdaqlıq gətirən bu xəbərin törətdiyi hissin təsiri ilə qələmi əlimə alıb, qələm yoldaşlarıma təbrikvari nə isə yazmaq qərarına gəldim.

"Laçın yurdu" jurnalının təsisçisi və baş redaktoru Arif Məmmədli üzərinə düşən məsuliyyəti yaxşı dərk edir. Buna heç bir şübhəm yoxdur. Çünki Arif müəllimin daxili dünyasıyla yaxından tanışam, qaldı ki, vətənpərvərlik hissi ilə qəlbinin hər an çırpınmasına, onun 1996-cı ildə çap olunmuş "Dağlar məni bağışlamaz" kitabındakı bu nisgilli misralar buna sübutdur.

*El yolu elsizdir, itib cığırlar,*
*İndi xatirələr yola çıxırlar.*
*İçimdə yol salıb dərdlər, ağrılar,*
*Daha itirməli nəyimiz qalıb.*

Mən Arif müəllimə arzu edirəm ki, bu jurnal erməni işğalına məruz qalmış Laçının və ümumi Qarabağın təbliğatını aparmaqla yanaşı keçmişimiz, tariximiz, Azərbaycanın maddi mədəniyyət abidələri ilə əlaqədar geniş və əhatəli mövzuların sayını hər an artırsın. Laçının işğalından sonra dünyaya gəlmiş gənclərin vətənpərvər ruhda böyümələrinə yaxından kömək etmiş olsun. Bu səbəbdən gələcək nəsil arasında təbliğat işini həyata keçirmək kimi tarixi missiyanı "Laçın yurdu" jurnalının kollektivi yorulmadan və böyük fəxrlə həyata keçirməlidir.

Hörmətli həmkarlarıma bu şərəfli, dəyərli və vacib işdə can sağlığı, möhkəm iradə və xüsusi olaraq Laçınlı günlər arzulayıram.

**Hörmətlə: Mübariz BİNNƏTOĞLU,**
***"Azad hüquqşünas" qəzetinin təsisçisi və baş redaktoru***

## TARİXİMİZİN UNUDULMAYAN SƏHİFƏLƏRİ

Laçın rayonu Azərbaycan Respublikasının cənub-qərbində dağlıq ərazidə yerləşir. 69 min əhalisi olan bu səfalı məkan 125 kənddən, 1 şəhərdən və 1 qəsəbədən ibarət idi.

Şimaldan Kəlbəcər rayonu, şərqdən Xocalı, Şuşa və Xocavənd rayonları, cənubdan Qubadlı, qərbdən isə Ermənistan Respublikası ilə həmsərhəddir.

Laçın 1923-cu ilə qədər Abdallar, sonra isə Laçın adlanıb. Rayonda əsasən maldarlıq, arıçılıq, əkinçilik, taxta-şalban istehsalı inkişaf etmişdi. Hazırda Laçın rayonunun əhalisi Azərbaycan Respublikasının müxtəlif ərazisinə səpələnmişdir.

1923-cü ildə Dağlıq Qarabağ Muxtar Vilayətinin təşkili ilə əlaqədar Şuşa qəzası ləğv olunmuş və əvəzində Ağdam qəzası təşkil edilmişdir. Həmin ildə Respublika Mərkəzi İcraiyyə Komitəsinin qərarına uyğun olaraq Qubadlı, Kəlbəcər və Laçın torpaqları vahid qəza halında birləşdirilmişdir. Qəza mərkəzi əvvəlcə Pircahan, sonra Minkənd, daha sonra isə Laçın təsdiq edilmişdir.

Laçın rayonu 1924-cü ildə yaradılmış, ərazisi 1883 kvadrat km-dir. Rayonun mərkəzi olan Laçın şəhərinin yerini Tağı Şahbazi Simurğ seçmiş və bu adı da ona o özü vermişdir.

Laçın şəhərinin böyüyüb inkişaf etməsində ilk addımları Tağı Şahbazi Simurğ, Hüsü Hacıyev, İsmayıl Şərifov, Canbaxış Abdullayev və onlarca başqaları atmış, onların çox böyük fədakar xidmətləri olmuşdur. İkinci dünya müharibəsi illərində 3660 nəfər Laçın rayon sakini cəbhəyə yollanmış, onlardan 2426 nəfəri geri qayıtmamışdır.

Şose yol Laçına 1950-ci illərin əvvəllərindən çəkilməyə başlamışdır. Dağlıq Qarabağı Ermənistan Respublikasının Gorus rayonu ilə birləşdirən respublika əhəmiyyətli şose yolun uzunluğu Laçın şəhərindən Gorus rayonuna kimi 54 km, Şuşa rayonuna isə 40 km, cəmi 94 km-dir. Respublika əhəmiyyətli Laçın-Qubadlı yolu 77 km-dir.

Rayon üzrə cəmi 2130 km uzunluğunda respublika və yerli əhəmiyyətli yol, 92 körpü vardır. Respublikanın paytaxtı Bakı şəhəri ilə şose yolla ara məsafəsi 450 km, Xankəndi dəmir yolu stansiyası ilə 60 km-dir.

1962-ci ildən sonra isə əvvəlcə şəhərin, sonra isə kəndlərin elektrikləşdirilməsi, radiolaşdırılması və telefon xətlərinin çəkilişi işinə başlanmışdır.

1992-ci il mayın 18-də Laçın rayonu erməni silahlı qüvvələri tərəfindən işğal edildi. Laçının işğalı ilə əlaqədar rayona 7,1 milyard ABŞ dolları dəyərində ziyan dəymişdir. 264 nəfər şəhid olmuş, 65 nəfər girov götürülmüş, 103 nəfər əlil olmuşdur. Rayon üzrə 1 yaşdan 16 yaşadək mövcud olan 24374 nəfər uşaqdan 18 nəfəri şəhid, 225 nəfəri əlil olmuş, 1071 nəfəri, o cümlədən 31 nəfəri hər iki valideynindən yetim qalmışdır. Bütün var-dövlətimiz, yeraltı və yerüstü sərvətlərimiz talan-qarət olmuş, torpaqlarımız hərraca qoyulmuş, ata-baba qəbiristanlıqlarımız düşmən tapdağında qalmış, rayonun 65507 nəfər əhalisi respublikanın 59 şəhər və rayonuna, "Taxtakörpü" qışlaqlarındakı 84 obaya məcburi köçkün düşmüşdür.

Ümumiyyətlə, rayonda 133 iri və xırda idarə, müəssisə və təşkilat, 52 kolxoz, 9 sovxoz və payçı kəndli fermer təsərrüfatı fəaliyyət göstərmişdir. Rayonun ərazisində 200-ə yaxın tarixi, mədəniyyət və memarlıq abidələri, onlarla kurqan, qala tipli arxeologiya baxımından faydalı olan abidələr, çoxlu sayda qəbirüstü abidələr, stellalar, at, qoç fiqurları, süjetli daşlar mövcuddur. Eləcə də bu ərazi çoxlu təbii sərvətləri, qiymətli mineral suları ilə zəngindir. Bu ərazidə olan abidələrin əksəriyyəti Qafqaz Albaniyası dövrünün yadigarlarıdır. Alimlərimizin verdiyi məlumata əsasən, bu ərazidə olan Qafqaz Albaniyası dövrü abidələrinin bir çoxu bizim eranın xristianlıqdan əvvəlki dövrünə aiddir. Bu yerlərin mürəkkəb relyefi, sərt iqlimi bir çox çay keçidlərində, yolların keçilməz hissələrində körpülərin inşasına səbəb olmuşdur. Onlar, əsasən, bir tağlı və yaxud iki tağlı körpülərdir.

Laçın rayonunun təbiəti, coğrafi relyefi, havası, suyu, orada yaşamış insanların bir çoxunun igid, qəhrəman, mərd, mübariz, görkəmli şəxsiyyətlər kimi yetişmələrinə və formalaşmalarına heç şübhəsiz ki, çox böyük təsir göstərmişdir. Məhz bütün bunların nəticəsidir ki, bir vaxtlar Laçın dağlarında at oynadan Sultan bəy erməni quldurlarının hücumlarının qarşısını qəhrəmanlıqla almış və Zabuxçayda Andronikin qoşununu darmadağın etmişdir.

Qarabağ torpaqları uğrunda gedən döyüşlərdə fədakarlıq göstərmiş və ölümlərindən sonra Azərbaycanın Milli Qəhrəmanı kimi fəxri ada layiq görülmüş həmyerlilərimiz Kamil Nəsibov, İsrafil Şahverdiyev, Oqtay Güləliyev, Fazil Mehdiyev, Qorxmaz Eyvazov və onlarca "Azərbaycan bayrağı" və digər ordenlərə layiq görülmüş mərd, mübariz insanlar məhz Laçın rayonunun yetirmələri olmuşdur.



## Laçın aşıqlarının "Sarı Aşıq işığında" adlı konserti olmuşdur

Aprelin 30-da Müslüm Maqomayev adına Azərbaycan Dövlət Filarmoniyasında Laçın rayonunun aşıqları "Sarı Aşıq işığında" adlı konsert proqramını təqdim etmişlər.

Mədəniyyət və Turizm Nazirliyinin, Azərbaycan Aşıqlar Birliyinin və Laçın Rayon İcra Hakimiyyətinin birgə təşkil etdikləri gecədə tanınmış mədəniyyət və elm xadimləri, ziyalılar iştirak etmişlər.

AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun direktor müavini, professor Məhərrəm Qasımlı tədbiri açaraq hazırda Laçında 100-dək aşığın el sənətini davam etdirdiyini, onların qüdrətli söz sərrafı Sarı Aşığın ilham bulağından su içdiklərini vurğulamışdır. Bildirmişdir ki, Heydər Əliyev Fondunun prezidenti, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın qayğısı sayəsində Azərbaycan aşıq sənəti YUNESKO-nun qeyri-maddi mədəni irs siyahısı"na daxil edilmişdir.



Mərdlik diyarı Laçının tarixini, təbii gözəlliklərini və memarlıq abidələrini, eləcə də Sarı Aşığın məqbərəsini əks etdirən filmin nüma-

yişindən sonra Laçın Rayon İcra Hakimiyyətinin başçısı Ramiz Cəbrayılov Sarı Aşığın həyat və yaradıcılığı haqqında geniş məruzə söyləmiş, Sarı Aşığın zəngin irsi ilə təkcə laçınlıların deyil, bütün xalqımızın öyünə biləcəyini diqqətə çatdırmışdır. Qeyd etmişdir ki, saf məhəbbət, zərif duyğular tərənnümçüsü Sarı Aşıq XVII əsrdə Laçının Güləbird kəndi yaxınlığında yaşamış, elə o torpağa da qovuşmuşdur.

Sarı Aşığın əsl adı Sarı olmuş, Yaxşı adlı bir qıza aşiq olandan sonra "Aşiq" təxəllüsü ilə tanınmış, bayatı janrının incilərini yaratmışdır.

Tədbirdə Aşıq Umbay, Aşıq Cabbar, Aşıq Famil, Pənah Bəyləroğlu, Aybəniz Laçınlı, Seymur və Nəsimi Məmiyevlər, Pərviz Qurbanov, Nasir Laçınlı, Pərviz Axundov, Elşad Abbasov, Əziz Xıdırov, Qalib Həşimov, Sahil Qurbanov və başqa sənətkarların bənzərsiz ifalarını tamaşaçılar alqışlarla qarşılamışlar.

## SARI AŞIQDAN İNCİLƏR

### Bayatılar

Mən aşıq qara niyaz,
Ağ üzdə qaranı yaz.
Hər kağızın başında
Mən bəxti qaranı yaz.

Mən aşiqəm gülə naz,
Bülbül eylər gülə naz.
Dünya yaman dünyadır,
Ağlayan çox, gülən az.

Aşıq başına bağlar,
Zülfün başına bağlar.
Bülbül öldü, gül soldu,
Qaldı başına bağlar.

Mən aşıq yara sızlar,
Bayqular yara sızlar,
Yaralının dərdini
Nə bilər yarasızlar?

### Gəlmədin

Vədə verib mənə gəlləm demişdin,
Gözüm qaldı intizarda, gəlmədin.
Sənsiz mənim ağlamaqdı munisim,
Mənsur kibi qaldım darda, gəlmədin.

Əydi qəddim firqətinin məlalı,
Necə xəm eyləmiş qaşın hilalı.
Saldı məni damə zülfün xəyalı,
Məni qoydun əşkibarda, gəlmədin.

Mən elə Aşiqəm, ey vədə xilaf,
Nizəyi-ahımdan çərx olar şikaf.
Belə olur, ay bimürvət, nainsaf,
Getdi əldən ixtiyar da, gəlmədin.

**O KƏND BİZİM KƏNDİMİZDİ**

## SUS KƏNDİ

Qonşu kəndlər (əhatəsi) Zabux kəndi, Cağazur kəndi, Qızılca kəndi, çayın o tayında Laçın şəhəri (Abdallar kəndi), Bəylik kəndi, Ağanus kəndi, Kərəviz kəndi.

Laçın şəhəriylə üz-üzə Mərkiz dağının ətəyində, Həkəri çayının sağ sahilində yerləşirdi. Laçında teleötürücü qüllə bu kəndin ərazisində - Mərkiz dağının zirvəsində quraşdırılmışdı.

Azərbaycandan Ermənistana və Naxçıvana gedən beynəlxalq nəqliyyat yolu, yüksək gərginlikli elektrik xətti və yeraltı rabitə kabel xətti bu kəndin ərazisindən keçirdi. Məşhur Nikolay körpüsü də bu kəndin ərazisində tikilmişdi. Onu da qeyd edək ki, erməni-müsəlman müharibəsi zamanı satqın Andronikin ordusunu babalarımız bu körpüdə yarı bölüb qırmışdılar. Zabuxdan təxminən 12 kilometr aralıda – Sus dərəsində baş verən tarixi hadisənin yeri nədənsə Zabux dərəsi kimi qeyd edilir. Görənlər nəql edirdilər ki, Sus bağlarında qırılan ermənilərin meyitinə görə 3 il bağlara girmək mümkün olmadı.

***Yurd yerləri:*** Tat dərəsi (bura Oba da deyirdilər), Aşağı Xallanlı, Yuxarı Xallanlı, Mərkiz.

***Tanınmış şəxsləri:*** Molla Lətif – Dövrünün oxumuş şəxsi olub, Susda mollaxanada dərs verirmiş. Böyük nüfuz sahibi olduğu üçün repressiya illərində ailəsiylə Sibirə sürgün olunur, sonradan arvadı sürgündən qayıdır, Molla Lətifin aqibətindən isə heç bir məlumat olmur. Kəndin örüşündəki məşhur Korca bulaqdakı novlu bulağı o öz puluyla düzəltdirib.

Molla İbrahim – Molla Lətifin şagirdi olub. Əlaçı oxuyurmuş. Molla Lətif bir yerə gedəndə onu əvəz etməyi ancaq balaca İbrahimə etibar edirmiş. Sovet hökumətinin qadağalarına baxmayaraq Molla İbrahim ömrünün sonuna qədər Quranı oxumaqdan dayanmazdı. Ətraf kəndlərdən də Quran açdırmaq üçün, ölənə dua oxutdurmaq üçün Molla İbrahimi deyib gələnlər çox olardı.

Nemət Qəhrəman oğlu – Susda ən varlı şəxs olub. Kolxoz onun var-dövlətiylə (qoyun sürüləri, böyük qazma tövlələri) qurulub. Bütün var-dövlətini kolxoza könüllü verib. NKVD haça dil atını aparanda at geri dönüb kişnəyəndə qapıda keçinir. Ata babam olan bu şəxsə aid ağ ev kənddə son dövrlərə qədər dururdu. Evin böyründəki böyük tövlələrin birində iri kəndi vardı. Məişət üçün qozdan hazırlanmış bu kəndinin bir

gözündə un, bir gözündə buğda, bir gözündə arpa, bir gözündə darı və s. olurdu. Yetimçiliklə böyüyən atam Laçında hansı kəndə getsə yaşlı şəxslər ona Nemət babamı səxavətli bir şəxs kimi tanıdıqlarını deyirdilər. Xənəzək kəndində atam at nalı alarkən erməni dəmirçi onun Sus kəndindən Nemətin oğlu olduğunu biləndə - aclıq illərində Nemət babamın qapısına getdiyini və ona babamın iki öküz yükü buğda verib yola saldığını xatırlayıb ağlayır.

Kəndin camaatı Şadmannı tayfasına aiddir.

***Kənddəki törəmələr:*** Dadaşuşağı, Mərkizdilər, Şadmanlı, Cəfəruşağı, Almuradlılar.

***Məşğuliyyətləri:*** – Susda örüş geniş, torpaq verimli olduğundan insanlar heyvandarlıq, bağçılıq, bostançılıq, arıçılıqla məşğul olurdular. Kənddə qış ovçuluğu da inkişaf etmişdi. Bunun üçün həm silah, həm də tələdən istifadə olunurdu. Xanımlar gəbə, kilim, xurcun, farmaş, corab toxuyurdular. Bu kənddə yaxşı çarıq tikənlər olub. Xanımlar onlar üçün tikilən zərif çarıqları toya geyərmişlər. Tut bağları cox olduğundan kənddə bəhməz və tut qurusu çox olardı. Çayda zavod qurub araq çəkərdilər. Qışda bu nemətlərin bir hissəsi qonşu erməni kəndlərində mübadilə olunardı - əsasən kartofla. Eyni zamanda Həkəri çayı kəndin ərazisindən keçdiyindən qışda çiləkən qurub balıq tutmaq (ovlamaq) ənənəsinə də yiyələnmişdilər. Yayda isə çayın qollarını qurutmaqla balıq tuturdular. Laçına elektrik və trotil şaşkası gələnə qədər Həkərinin balığını yığıb yığışdırmaq olmazdı. Ona görə də aclıq illərində çayqırağı kəndlərdə aclıq çəkənlər olmayıb. Əksinə qonşu kəndlər də bu kəndlərin nemətlərindən bəhrələnərmişlər. Yaşlı insanlardan aclıq illərində laçınlıların ermənilərə də əl tutduqlarını dönələrlə eşitmişəm. Onu da xüsusi vurğulamaq lazımdı ki, kəndin güney örüşündə - Xallanlıda dünyanın ən zəhərli gürzə ilanı olurdu. Orda həm də xınalı kəklik çox olardı.

Kənddə ta qədimdən əhəng quyusu olub. Burada xüsusi daşları yandırıb əhəng əldə edirmişlər. Əhənglə həm divar hörər, həm də evləri, qara damları ağardarmışlar.

***Susda peşəkar musiqiçilər*** – zurnaçılar olub. Ətraf kəndlərin toy məclislərini yola vermək üçlükdən ibarət (zurna çalan, dəmkeş (ona yançı da deyirdilər) və nağara çalan) bu dəstənin boynuna düşərdi.

**Yer adları.** - ***Həkəri çayı ilə bağlı yer adları:*** Darrar, Gərriyin gölü, Ada, Çay yolu, Nikolay körpüsü (Padşahlı körpüsü də deyilirdi).

***Örüşdəki bulaq adları:*** Korca bulaq, Şor bulaq, Əlik bulağı, Qara su, Mağalın bulağı, Damcılı bulaq.

***Kənddəki bulaq adları:*** Quşquş bulağı, Dam bulaq, Sarının bulağı.

***Bağ adları:*** Aşağı bağ, Havanın tutları, Almalıq, Şitillik, Zavod, Cırrıx, Qəninin şivliyi, Böyük bağ, Dəhnə.

***Örüş adları:*** Şalvar zəmi, Qara tikanlı, Sulu daş, Haça daş, Sahverdi qalası, Əhəng quyusu, Xırman təpə, Alçalı dərə, Pərdili, Navlar, Navlar yolu, Daşatan, Daşatan yolu, Asdanın kahası, Cavadın çənəyi, Bədəlin çənəyi, Araq zavodu, Şamlıq, Karvan yolu, Güney yolu, Quzey yolu, Yanıq arduc, Haxçik ölən dərə, Adam itən, Böyük dərə, Kurkurrar, Qollu ağac, Yanıq armud, Mollayatan qaya, Zaman yerləri, Yolaşan, Sarayın yeri, Vəl divəyi, Böyük yer, Kalafalıq, Qədim ölən, Sarı meşə, Məmmədxanın armudu, Qıvıc ağacı, Arpa tələsi, Dadaşın çənəyi, Qanlı armud, Mərkiz, Qəmər oynayan, Qətər qaya, Sulu dərə, Mahmudun yalı, Keşiş qalağı, Yediyarın qəbri, Fərmanın palıdı, Xanların armudu, Top palıd, Fərmanın qozu, Vəlinin qozu, Dadaşın qozu, Nemətin palıdı, Çənəklər, Çuxurlar, Tələlər, Tək ağac.

**Hazırladı: İlham QƏHRƏMAN**

## TƏBRİK



**Əziz həmkarlarım!**

Sizin yaradıcı kollektivin araya-ərsəyə gətirəcəyi və bu yaxınlarda ilk nömrəsinin işıq üzü görəcəyi "Laçın yurdu" jurnalının nəşrə başlaması xəbəri məni sizi istəyənlərdən biri kimi çox sevindirdi. Ümid edirəm ki, bu jurnal tariximizin, ədəbiyyat və incəsənətimizin, etnoqrafiyamızın, adət və ənənələrimizin təcəssümünü özündə əks etdirməklə yanaşı, Laçın və laçınlıların – ümumiyyətlə xalqımızın mənəvi ruhunun təminatçısı kimi çıxış edərək, oxucuların daxili aləminin zənginləşməsində böyük rol oynayacaqdır. Arzu edərdim ki, jurnalda təkcə Laçın yurdu - onun keçmişi, bu günü, gələcəyi, ziyalıları, yaradıcı adamları, tarixi, şəxsiyyətləri, qəhrəmanları deyil, respublikamızın başqa bölgələri haqqında da müfəssəl yazılar öz əksini tapsın. Mən istedadınıza, kəsərli qələminizə şübhə etməyən bir oxucu kimi jurnalın yüksək elmi, bədii və publisistik üslubda, oxucuların istədiyi şəkildə nəşr olunacağına inanıram. Bu çətin və şərəfli yolda sizə uğurlar diləyir, "Laçın yurdu" nun hamı tərəfindən məhəbbətlə qarşılanmasını arzulayıram.

**Mütəllim HƏSƏNOV,**
***şair-publisist, AYB-nin üzvü, "H.B.Zərdabi" mükafatı laureatı***

## FƏTƏLİPƏYƏ KƏNDİ

Fətəlipəyə, Ağanus, Turşsu, Kərəviz, Unannovu və Ərəb kəndlərini özündə birləşdirən Fətəlipəyə kənd icra nümayəndəliyi rayon mərkəzindən 8 km məsafədə yerləşirdi.

1960-cı ilə qədər nümayəndəliyin ərazisində 17 para kənd – Ağanus, Fətəlipəyə, Unannovu, Ərəb, Mehrab, Qubaslı, Palçıqlı, Sarı yal, Məşədi Məmmədlər, Qamışlı, Mehin Kahası, Mahmud bulağı, Kahalar, Turablı, Qışlaq, Xudumlar və Kərəviz kəndləri olmuşdur. Sonradan hökumət qərarına uyğun olaraq bu kəndlərin əksəriyyətindən əhali köçürülərək hal-hazırda nümayəndəliyin tərkibində olan kəndlərdə, Laçın şəhərində, Qarabağda və Bakıda məskunlaşdırılmışdır.

1930-cu illərin kolxoz quruculuğu dövrünə qədər bu kəndlərin inzibati mərkəzi Qışlaq olmuş, əhalisi Bağırbəyli adlanmışdır. Yüzbaşılıq yerləşən bu kənddə yüzbaşı vəzifəsini böyük nüfuz sahibi olan Həmid adlı şəxs icra edərmiş. Bəzi ehtimallara görə, bu kəndlərin əhalisi Nadir şah Əfşarın hakimiyyəti zamanı Cənubi Azərbaycan ərazisindən gələrək burada məskunlaşmışlar. Digər bir ehtimalda isə bu yerlərin adının IX əsrdə Ərəb Xilafətinin Albanlara qarşı apardığı müharibədə öldürülərək burada dəfn edilən bir döyüşçünün adı ilə bağlı olduğu bildirilir. Hovuzun dərəsi və Çiyələkli adlanan ərazilərdə qədim Alban kilsələrinin qalıqları bu gün də qalmaqdadır. Bu faktın özü sübut edir ki, heç vaxt bu ərazilərdə ermənilər yaşamamışlar. Deyilənlərə görə, ərəblər bu torpaqları işğal etdikləri zaman ərəb xilafətinin nümayəndəsi - varlı mömin Xələf adlı şəxs hazırkı Malxələf kəndində məskən salır. Çoxlu mal-dövlət sahibi olduğu üçün hamı ona Mallı Xələf deyərmiş. Mallı Xələfin bir neçə övladı olub. Onlardan ikisini -Məlik və Fətəli adlı oğlanlarını ayırıb, hər birinə çoxlu sayda mal-qara verir. Məlik adlı oğluna hazırkı Məlikpəyə adlanan yerdə, Fətəli adlı oğluna isə indiki Fətəlipəyə kəndi ərazisində mal-qara üçün pəyə (tövlə) tikdirərək orada yerləşdirir. Beləliklə, Məlikpəyə və Fətəlipəyə kəndlərinin bünövrəsi qoyulur, kəndlərin adı belə yaranır. Malxələf kəndi isə Mallı Xələfin öz adı ilə bağlıdır.

1960-cı ilə qədər Qardaşlıq adlanan o zamankı kənd sovetliyi sonradan Fətəlipəyə kənd soveti adlandırılıb. İşğala qədər nümayəndəliyin 2443 ha ərazisi olub ki, onun da 500 ha Qubadlı rayonunun Başarat kəndində Binə adlanan ərazidə idi. Bütövlükdə ərazinin 10%-i əkinə yararlı, 40%-i otlaqlar, 20%-i meşəlik, 30%-i dağlıq idi.

İşğala qədər Ağanus kəndində 1 orta məktəb, 1 kənd mədəniyyət evi, 1 uşaq bağçası, 1 kitabxana, 1 feldşer-mama məntəqəsi, 1 mağaza, Fətəlipəyə kəndində 1 ibtidai məktəb, 1 kitabxana, 1 feldşer-mama məntəqəsi, 1 mağaza, Unannovu kəndində 1 ibtidai məktəb, 1 kitabxana, 1 feldşer-mama məntəqəsi, 1 mağaza, Turşsu kəndində 1 mağaza, 1 feldşer-mama məntəqəsi fəaliyyət göstərirdi.

Nümayəndəliyin ən böyük kəndi olan Ağanusda ilk məktəb 1924-cü ildə fəaliyyətə başlamış, ilk müəllim isə Türkiyədən gəlmiş Müslüm adlı şəxs olmuşdur. İlk məktəb binası isə 1928-ci ildə inşa edilmiş, yaşlı kənd sakinlərinin dediyinə əsasən, kəndin Ələkbər adlı mütərəqqi fikirli sakini bu binanın tikilib istifadəyə verilməsində böyük rol oynamışdır.

Hər zaman elmə yüksək qiymət verən və onun inkişafına çalışan Ağanus kəndində hələ XIX əsrdə Hacı Molla Şükür kimi şəxsiyyət yetişmişdir. Azərbaycan Sovet Ensiklopediyası tərtib olunan zaman xalqımızın digər ziyalıları ilə yanaşı, Hacı Molla Şükür haqqında da müfəssəl məlumat verilmişdir. Kəndin adının Ağanus adlandırılmasının Dağ Yunusun və ya Ağa Yunus adlı böyük var-dövlət sahibi olan bir şəxsin adı ilə bağlı olduğu bildirilir. 1870-ci illərdə Nəcəfdə dini təhsil alan Hacı Molla Şükür uzun illər Qarabağın axundu olub. Qarabağda və Zəngəzurda böyük nüfuz sahibi olan Hacı Molla Şükür 1921-ci ildə vəfat edib. Ölüm yatağında olarkən bildirib ki, vəfat etdiyim gün bir ağ yağış yağacaq, məni həmin yağışın suyu ilə yuyarsınız. Yaşlı insanların söylədiklərinə görə, kənd sakinləri Hacının vəsiyyətini yerinə yetiriblər. Hacının oğlu Məhərrəmov Məhəmməd uzun müddət Qubadlı qəzasının pristavı işləyib. Nəvəsi Məhərrəmov İsa Abutalıb oğlu isə uzun illər Ağdaş rayon partiya komitəsinin I katibi və Azərbaycan SSR Ali Sovetinin deputatı olub.

Nəinki Ağanusun, eləcə də digər qonşu kənd sakinlərinin savadlanmasında əvəzsiz rol oynayan məktəb kollektivi hər zaman özünün qabaqcıl məzunları ilə fəxr etmişdir. Bu məktəbin məzunu olmuş Muradxan Mahmud oğlu Cabbarov müasir Azərbaycan tarixində görkəmli partiya işçisi, təcrübəli rayon rəhbəri və xalqımızın ümummilli lideri Heydər Əliyevin silahdaşı kimi tanınmışdır. Dəfələrlə Azərbaycan SSR Ali Sovetinin deputatı olmuş, şöhrət ordenli filologiya elmləri doktoru, professor Xasay Mahmud oğlu Cabbarov, tibb elmləri namizədi Vəli Sadıq oğlu Həsənov, tarix elmləri namizədləri Solmaz Səttar qızı Məhərrəmova və Məhəmməd Teymur oğlu Hüseynov da vaxtilə orta təhsillərini bu təhsil ocağında almışlar. Fətəlipəyə kənd nümayəndəliyinə daxil olan kəndlərdən çıxmış Şahlar Xəlilov, Nəriman Əliyev, Aydın Abbasov, Ağayar İsmayılov, Əslixan Məhərrəmov, Vaqif Şükürov, Elbrus Sadıqov

və Bahadur Quliyev kimi ağsaqqal ziyalılar bu gün də xeyirdə-şərdə elin-obanın yanındadırlar. Ağanus kəndində dünyaya göz açmış Elçin və Loğman Lətif oğlu Məhərrəmov qardaşları hərbi təyyarəçilər kimi bu gün Vətənə ləyaqətlə xidmət edir, düşmən üzərinə hücuma keçmək üçün Ali Baş Komandanın əmrini gözləyirlər. Birinci Qarabağ müharibəsində nümayəndəliyin 4 nəfər igid övladı öz canını Vətənə qurban verdi. Şahverdiyev İsrafil Şahverdi oğlu Azərbaycanın Milli Qəhrəmanı (Unannovu kənd sakini), Məhərrəmov Təvəkkül Adil oğlu (Ağanus kənd sakini), Cabbarov Kamal Bəbəş oğlu (Fətəlipəyə kənd sakini) və Mərdanov Bəbir (Mehman) Əvəz oğlu (Turşsu kənd sakini).

İşğala qədər nümayəndəliyin ərazisində 4 mağaza, 1 ATS (100 yerlik), 1 uşaq bağçası fəaliyyət göstərib. Evlər tamamilə qazlaşdırılmış, telefonla təmin edilmiş, həyətlərin böyük əksəriyyətinə su xətləri çəkilmişdir.

Kənd sakinlərinin əsas məşğuliyyəti arıçılıq və maldarlıq idi. İşğala qədər sovxoz təsərrüfatında 2000-ə yaxın arı ailəsi və 600-ə yaxın iribuynuzlu mal-qara saxlanılırdı. Şəxsi təsərrüfatlarda isə 700-ə yaxın iribuynuzlu, 2000-ə yaxın xırda buynuzlu mal-qara var idi. Əkənəklər qəbiristanlığı yaxınlığındakı Ardıc pir, Unannovu ərazisindəki Qaratikan pir və Ərəb kəndindəki Ələm ağacı o əraziləri məcburiyyət qarşısında tərk etmiş insanların bu gün də inam gətirdikləri müqəddəs yerlərdəndir. Bu insanların hər biri Daş bulağın, Soyuq bulağın, Əzədin bulağının, Hovuzun bulağının və mineral su olan Turşsu bulağının suyundan içəcəkləri və Ağdaş, Armudluq, Alı yeri, Xırmanlar, Dəflər, Ağ güney, Tədaran, Göllər, Korbulaq, Böyük yer, Ağanataplar, Kənəyin dağı, Çiyələkli, Kamal yalı, Böyük qumlaq, Kiçik qumlaq adlanan ərazilərdə gəzəcəkləri günə olan inamlarını öz ürəklərində yaşadır və bu inamla da gələcəyə gedirlər.

Hazırda nümayəndəliyin 131 təsərrüfat və 486 nəfərdən ibarət əhalisinin 12 ailə 53 nəfəri Bərdə, 1 ailə 2 nəfəri Beyləqan, 1 ailə 4 nəfəri Qax, 1 ailə 4 nəfəri Xaçmaz rayonlarında, digər sakinlər isə Bakı və Sumqayıt şəhərlərində müvəqqəti məskunlaşmışlar. Ağanus kənd orta məktəbi Bərdə şəhərində, Ağanus kənd mədəniyyət evi, 3 kitabxana və 4 feldşer-mama məntəqəsi Bakı və Sumqayıt şəhərlərində fəaliyyət göstərir.



**Pərviz SEVDİMALIYEV**

## MƏKTƏBLƏRİMİZ

### İMANLAR KƏND ORTA MƏKTƏBİ

Vüqar Niftəliyev adına İmanlar tam orta məktəbi Sumqayıt şəhəri, Hacı Zeynalabdın Tağıyev qəsəbəsində 1993-cü ildən fəaliyyət göstərir. Şagirdlərin təlim-tərbiyəsi ilə 25 müəllim məşğul olur.



Xatırladaq ki, hələ ötən əsrin 60-cı illərində fəaliyyət göstərən bu məktəb Sahab və Məzahir Mustafayevlərin şəxsi evlərində yerləşirdi. İlk müəllimləri Bayram Bayramov və Əzim Əzimov olan məktəb sonralar 8 illik məktəb statusu alaraq Nuhiddin və Muxtar Bayramovların evlərinə köçürüldü. Bayramov qardaşları Şuşa şəhərində yaşadıqlarına görə kənddəki evlərindən məktəb kimi istifadə edilməsinə razılıq verdilər. Bir müddət sonra isə Məzahir Mustafayevin təşəbbüsü ilə xüsusi layihə əsasında məktəb üçün yeni bina tikildi. Bundan sonra orta məktəbə çevrilən bu təhsil ocağı məlum hadisələrə qədər çox təcrübəli, məsuliyyətli, öz peşələrini ürəkdən sevən müəllimlərin sayəsində nüfuzlu təhsil müəssisəsi kimi tanınırdı.

Elə qaçqınlıq illərində də bütün çətinliklərə baxmayaraq tarixi ənənəsini qoruyub saxlaya bildi. Yuxarıda adı çəkilən qəsəbədə müvəqqəti

məskunlaşan məktəb Sabir Novruzovun rəhbərliyi ilə fəaliyyətini uğurla davam etdirdi.

2003-cü ildən isə məktəbin direktoru Eldar Pirəliyevdir. 1972-ci ildə M.F.Axundov adına Pedaqoji Dillər İnstitutunun (indiki Slavyan Universiteti) rus dili və ədəbiyyatı fakültəsini bitirən, 46 illik pedaqoji təcrübəsi olan Eldar müəllim həmişə prinsipial mövqeyi ilə seçilib. Bu gün də pedaqoji kollektivin gücündən yararlanaraq təlim və təhsil prosesinin müasir tələblər səviyyəsində qurulmasına çalışır.

Qəribə təsadüfdür ki, ayrı-ayrı illərdə məktəbə rəhbərlik etmiş hər üç şəxs-Məzahir Mustafayev, Sabir Novruzov və Eldar Pirəliyev eyni universitetin məzunudur.



İmanlar kəndinin əhalisi əsasən Qaradağ rayonunun “Qurd qapısı” adlanan yaşayış massivində məskunlaşdığı üçün burada da məktəb açılmasına zərurət yarandı. Yaxınlıqda başqa məktəbin olmamasını nəzərə alan əlaqədar təşkilatların və kənd camaatının birgə səyi nəticəsində şagirdlərin təhsildən kənarda qalmasına imkan verilmədi. Hal-hazırda gənc kadr Kəmaləddin Niftəliyevin rəhbərlik etdiyi, müxtəlif ixtisas müəllimlərinin cəmləşdiyi kiçik bir kollektiv üzərinə düşən vəzifənin öhdəsindən layiqincə gəlir.

## LAÇIN RAYON 10 №-Lİ TAM ORTA MƏKTƏB

1992-ci ildə bədnam qonşularımız tərəfindən dədə-baba torpaqlarımız işğal olundu. Taleyimizə qaçqınlıq həyatı yaşamaq düşdü. Yeni həyata alışmaq ilk günlər çox çətin idi. Amma alışdıq. Təbii ki, bu alışqanlıq müsbət, öyünüləsi bir keyfiyyət olmasa da taleyimizlə barışdıq. Soydaşlarımızın bizə münasibəti də birmənalı olmadı. Qayğı da gördük, yersiz qınaqlara da tuş gəldik. Güzaranımız pis keçəndə rişxənd eləyənlər, özümüzü oda-közə vurub çörək pulu qazananda isə "kefdədirlər" deyənlər də tapıldı. Yaxşı ki, xeyirxah insanlar bədxahları üstələdi. Qolumuzdan tutanlar, dərdimizə şərik olanlar bizi sınmağa qoymadılar. Onsuz da ulularımızın min illər boyu yaşadığı doğma yurdumuzdan qovulmaqla sınmışdıq. İkinci dəfə sındırmağa nə ehtiyac vardı?!



İşsizlik bütün qaçqınların qarşısında birinci dərəcəli problem kimi dururdu. O vaxt qaçqın məktəblərinin yaradılması istiqamətində də ciddi tədbirlər görülürdü. Laçın rayon İcra Hakimiyyətinin məsul işçisi Kamal Cabbarovun, təhsil şöbəsinin müdiri Tofiq Nəcəfovun bu məsələnin həllində prinsipial mövqelərini, fədakarlıqlarını yada salmamaq mümkün deyil. Çəkilən zəhmət tezliklə öz bəhrəsini verdi. Beləliklə, ilk qaçqın məktəbləri yaradıldı. Yaradılan ilk qaçqın məktəblərindən biri də Laçın rayon 10 №-li tam orta məktəb idi. Məktəbin yaradıcısı və ilk direktoru Yusif Hüseynov oldu. Bakı şəhərinin mərkəzində yerləşən, tez-tez ünvanını dəyişən bu məktəb 2000-ci ildə məcburi köçkün statusu daşıyan məktəb yaşlı uşaqların daha çox cəmləşdiyi Sulutəpə



qəsəbəsində Yusif müəllimin şəxsi vəsaiti hesabına tikilmiş binaya köçürüldü. Hal-hazırda 350-yə yaxın şagirdin təhsil aldığı, 45-50 nəfər müxtəlif ixtisaslı müəllimin çalışdığı səmimi bir kollektivə Gülşən Tağıyeva rəhbərlik edir. Tədris hissə müdiri Məhəmməd Mirzəyev, tərbiyə işləri üzrə direktor müavini Musa Məmmədov şagirdlərin savadlı, hərtərəfli şəxsiyyət kimi formalaşmaları üçün böyük əmək sərf edirlər. 2000-ci ildən məktəbin dərs hissə müdiri işləmiş Ramil Bəylərov indi başqa sahədə çalışsa da, demək olar ki, kollektivin fəxri üzvüdür. Təbii ki, qazanılan uğurlarda pedaqoji kollektivin hər bir üzvünün müstəsna xidməti var. 2009/2010-cu tədris ilində məktəbin 8 məzununun ölkəmizin reytinqli universitetlərinə qəbul olunması da məhz müəllim əməyinin nəticəsidir.

Tədris etdikləri fənləri şagirdlərə yüksək səviyyədə mənimsətdiklərinə görə Rüqiyə Xəlilova, Ruhiyyə Rəsulova, Əlvan İsgəndərova, Zöhrə İbrahimova, Müşfiqə İsmayılova və Gülnarə Məmmədova məktəbin "Fəxri fərmanı"na layiq görülüblər.





Onu da söyləmək xoşdur ki, 1996-cı ildə işıq üzü görən "Dağlar məni bağışlamaz" adli ilk şeirlər kitabımın təqdimatı da bu məktəbdə keçirilib. Təqdimat mərasimində hay-küydən, pafosdan uzaq, təbiilikdən yoğrulan şeirləri və poemaları ilə xalqımızın böyük məhəbbətini qazanmış sevimli şairimiz Ağa Laçınlının doğma ləhcəmizdə bulaq suyu kimi dumduru çıxışı, qəlbimə toxunmaqdan ehtiyatlana-ehtiyatlana verdiyi məsləhətlər gözlərim önündə tez-tez canlanır.

**Arif MƏMMƏDLİ**

## TƏBRİK

## QONAQLI-QARALI ELLƏRİMİZ YADA DÜŞDÜ



"Laçın yurdu" - ulu, müqəddəs bir məkanımızın adını özündə yaşadan jurnalın çapa başlaması xəbəri bizi xeyli duyğulandırdı. Köhlən yoran yoxuşlarımız, qartallı yalçın qayalarımız, oymaq-oymaq gəzdiyimiz aşırımlar, gədiklər, ilxıları, mal-qarası, qoyun-quzu sürüləri bir-birinə qarışan göy yaylaqlar, qonaqlı-qaralı ellərimiz-elatımız yada düşdü. Köç karvanı kəsilmiş binələrimizin, yetim qalmış yurd yerlərimizin həsrəti burnumuzun ucunu göynətdi.

Laçının uğrunda verdiyimiz 300 şəhidin məzarı başında, həsrəti sorağında saç yolan qız-gəlinlərimizin fəryadı, ah-naləsi ürəyimizə od saldı. Bu hisslərin qəlbimizi çuğladığı bir vaxtda yaşamaq nə qədər ağır olsa da, "Laçın yurdu" jurnalını varaqlamaq, onun səhifələrində ana yurdun bu müqəddəs parçasının nəfəsini duymaq, ulu keçmişimizlə, tariximizlə, bu tarixi şərəflə yazmış ərlərimizlə, ərənlərimizlə tanış olmaq bir o qədər xoşdur. Onu da unutmayaq ki, Sultan bəyin, Xosrov bəyin keçdiyi şərəfli yolun davamçısı olmaq hər bir Vətən övladının, Zəngəzur balasının ürəyindən keçən ən ülvi hissdir.

Əminik ki, vətənpərvər qələm dostlarımız jurnalın hər sayında soydaşlarımızı, yurddaşlarımızı Laçın yurdunu qaraçı-hayların tapdağından xilas etməyə çağıracaq. Bu çağırışın cavabsız qalmayacağına da öz varlığımız kimi inanırıq. Çox çəkməyəcək ki, Azərbaycan oğulları müqəddəs üçrəngli bayrağımızı doğma Laçında, Hoçazda, İşıqlıda dalğalandıracaqlar. Onda "Laçın yurdu" jurnalını da elə Laçının özündə oxuyacaqlar. Bizlər də o müqəddəs yerlərimizi ziyarətə gedəcəyik! Bu inamın işığında "Laçın yurdu"nun kollektivinə dönməz mübarizə və yaradıcılıq uğurları arzulayırıq.

"Bütöv Azərbaycan" qəzetinin kollektivi adından baş redaktor:

**Tamxil ZİYƏDDİNOĞLU,**
***"Zəngəzur" Cəmiyyətləri İctimai Birliyinin sədr müavini***

MİLLİ QƏHRƏMANLARIMIZ

## KAMİL NƏSİBOV



Kamil Baladə oğlu Nəsibov 1946-cı ildə Bozlu kəndində anadan olub. Orta məktəbi Minkənddə bitirərək 1963-cü ildə hərbi xidmətə çağırılıb. 1973-1978-ci illərdə Azərbaycan Politexnik İnstitutunda (indiki Texniki Universitet) ali təhsil alıb.

1988-ci ildə erməni separatçılarına qarşı mübarizə aparmaq məqsədilə könüllülərdən ibarət özünümüdafiə dəstəsi yaradıb. Laçının işğalından sonra da Güləbird, Səfiyan, Suarası, Cicimli kəndləri uğrunda gedən döyüşlərdə iştirak edib.

28-29 iyul 1992-ci ildə Laçında gedən gərgin döyüşlərdə həlak olub. Ağcabədi şəhərində dəfn edilib.

Ailəli idi. Dörd övladı yadigar qalıb.

## İSRAFİL ŞAHVERDİYEV



İsrafil Şahverdi oğlu Şahverdiyev 1952-ci ildə Unannovu kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra 1971-1974-cü illərdə keçmiş Sovet Ordusu sıralarında hərbi xidmət keçib.

1975-ci ildə Laçın rayon DİŞ-də işə götürülüb. 1988-ci ildən erməni işğalçılarına qarşı vuruşub. Döyüşlər zamanı o bir neçə erməni tutub, dörd döyüş maşını və xeyli sursat ələ keçirib. Qəhrəmanlığına görə ona baş leytenant rütbəsi verilib, Laçın rayon Kooperativlər İttifaqının "Sultan bəy" mükafatına layiq görülüb.

1994-cü il yanvarın 13-də Horadiz döyüşlərində həlak olub. Bakı şəhərindəki Şəhidlər Xiyabanında uyuyur.

Ailəli idi. Üç övladı yadigar qalıb.



## QORXMAZ EYVAZOV

Qorxmaz Abış oğlu Eyvazov 1967-ci ildə Güləbird kəndində doğulub. Orta məktəbi doğma kəndində bitirib. 1985-1987-ci illərdə hərbi xidmətdə olub.

1992-ci ildə Laçın rayon DİŞ-də işə götürülüb. Döyüşlərdə cəsarətlə döyüşüb, qorxmazlığı ilə fərqlənib.

1994-cü il fevral ayında Füzuli rayonunun Mehtili kəndində həlak olub. Sumqayıt şəhərindəki Şəhidlər Xiyabanında torpağa tapşırılıb.

Ailəli idi. Üç övladı yadigar qalıb.



## OQTAY GÜLƏLİYEV

Oqtay Güləli oğlu Güləliyev 1962-ci ildə Xaçınyalı kəndində dünyaya göz açıb. Laçın şəhər 1 saylı orta məktəbi bitirib. 1980-1982-ci illərdə hərbi xidmətdə olub. 1986-cı ildən rayon DİŞ-də işləyib. 1989-cu ildə Poltava Kooperativ İnstitutunu qiyabi bitirib.

1991-ci ildə rayon DİŞ-də bölmə komandiri təyin olunub. Şuşa, Kərkicahan, Malıbəyli, Kosalar, Daşaltı uğrunda gedən döyüşlərdə iştirak edib. Onun komandir olduğu dəstə Laçın kəndlərinin müdafiəsi zamanı ermənilərin xeyli döyüşçüsünü məhv edib, yüksək rütbəli zabitlərini əsir götürüb. Döyüşlərin birində yaralanıb. Sağaldıqdan sonra yenidən orduya qayıdıb.

1992-ci il oktyabrın 11-də Avazlar kəndi yaxınlığında qeyri-bərabər döyüşdə həlak olub. Bakı şəhərindəki Şəhidlər Xiyabanında dəfn olunub.

Ailəli idi. İki övladı yadigar qalıb.

## FAZİL MEHDİYEV



Fazil Umud oğlu Mehdiyev 20 avqust 1966-cı ildə Ələkçi kəndində doğulub. 1983-cü ildə orta məktəbi bitirib. 1986-1988-ci illərdə hərbi xidmətdə olub. Sonradan ailələri ilə birlikdə Ağdam rayonuna köçüb.

Erməni təcavüzkarlarının torpaqlarımıza basqın etdiyi vaxtdan Ağdam rayon DİŞ-də fəaliyyətə başlayıb. İlk günlərdən döyüş hazırlığı, cəsarəti ilə seçilib. Xocalı, Ağdərə, Qaradağlı, Kərkicahan və digər kəndlərin müdafiəsində şəxsi igidlik və sücaət göstərib.

1991-ci il sentyabrın 24-də postlara baş çəkərkən ermənilərlə qarşılaşıb. Təkbaşına döyüşdə həlak olub. Ağdam rayonunun Şəhidlər Xiyabanında dəfn olunub.

Subay idi. Bakı şəhərində adına küçə var. Bakı şəhəri, Xətai prospektində büstü qoyulmuşdur.

Azərbaycan Respublikası prezidentinin 8 oktyabr 1992-ci il tarixli, 264 saylı fərmanı ilə Mehdiyev Fazil Umud oğluna ölümündən sonra “Azərbaycanın Milli Qəhrəmanı” adı verilmişdir.

Haqqında “Qızıl qələm” mükafatı laureatı Elbrus Şahmar “Fazilin Allah dərgahına gedən ömür yolu” (“Zərdabi LTD” MMC, Bakı, 2011) adlı kitab yazmışdır.



## ŞƏHİDLƏRİMİZ

### VÜQAR NİFTƏLİYEV

Vüqar Cavanşir oğlu Niftəliyev 1966-ci il noyabrın 17-də Laçın rayonunun İmanlar kəndində anadan olub. 1984-cü ildə İmanlar kənd orta məktəbini bitirdikdən sonra ordu sıralarına yollanıb. Hərbi xidmətini başa vuraraq doğma kəndinə qayıdan Vüqar təsərrüfatda çalışıb. Həmişə işgüzarlığı və qoçaqlığı ilə seçilib. Ona tapşırılan bütün işlərin öhdəsindən layiqincə gəlib.

1988-ci ildə baş verən hadisələr gənclərin dünyagörüşünə güclü təsir göstərirdi. Onların SSRİ-yə bəslədikləri inam puça çıxırdı.



*Vüqar Niftəliyev (şəkildə ortada)*

Ermənistanla sərhəd kəndlərdə azərbaycanlıların tez-tez qətlə yetirilməsi xalqın qəzəbini coşdururdu. Çox təəssüf ki, SSRİ-nin dağılmasının mümkünsüzlüyü haqqında aparılan təbliğat əhali arasında çaşqınlıq yaratmışdı.

Respublikada hökm sürən xaos, hakimiyyətsizlik nəticəsində 1992-ci il may ayının 17-18-də Laçın rayonu da erməni qəsbkarları tərəfindən işğal olundu. Vüqar Niftəliyev ailə üzvləri ilə birlikdə doğma yurdu tərk etmək məcburiyyətində qaldı, Cəbrayıl rayonunda məskunlaşdı. Bir müddətdən sonra Cəbrayıl rayonu da zəbt edildi. İkinci dəfə qaçqın düşən ailə Qobustan rayonunun Şıxzərli kəndində sığınacaq tapdı.

Torpaqlarımız işğal altında ola-ola asudə gəzməyi özünə təhqir sayan Vüqar 1993-cü ildə könüllü olaraq cəbhəyə getdi. Ağdam və Füzuli uğrunda gedən döyüşlərdə ermənilərə qarşı vuruşan Vüqar Niftəliyev 1994-cü ildə Ağburun istiqamətindəki döyüşlərdə həlak oldu. Subay idi. Nə qədər arzuları yarımçıq qaldı. Amma Vətən uğrunda şəhid olanlar heç vaxt unudulmur. Bir vaxtlar təhsil aldığı, hal-hazırda H.Z.Tağıyev qəsəbəsində fəaliyyət göstərən İmanlar kənd orta məktəbi şəhidin adını daşıyır. Vüqarın və bütün şəhidlərimizin xatirəsi qəlbimizdə daim yaşayacaqdır.

## TƏBRİK

### Laçının işğaldan azad edilməsi xəbərini oxumaq xalqımıza qismət olsun



"Laçın yurdu" ədəbi-bədii publisistik jurnalının nəşrə başlamasını regionlarımızın tarixini araşdırmaq, rayonun həyatında baş verən hadisələrə güzgü tutmaq, mənəviyyatımızın və mədəniyyətimizin təbliği baxımından xeyirxah bir arzunun reallaşması kimi dəyərləndirirəm. Azərbaycanın şimal-qərb qapısında bəzi rayonlarla yanaşı Laçının da işğal altında olması yaralı yerimizdi. Laçın dərdinin, yanğısının başqa mətbu orqanlarda da işıqlandırılmasına baxmayaraq, məncə, əsas məqsədi Laçının 125 kəndini, obasını, qaçqınların güzəranını, tarixi həqiqətləri, ziyalıların fəaliyyətini, qəhrəmanlıq səhifələrini diqqətdə saxlamaq olan bu dərgi həm də yaradıcı insanlar üçün tribunaya çevriləcək.

İnanıram ki, "Laçın yurdu" jurnalı səhifələrində əmək adamlarına, saz-söz bilicilərinə, Sarı Aşığın bayatılarına, tarixi abidələr və ayrı-ayrı inanc yerlərimiz haqqında məlumatlara da geniş yer ayıracaq.

Arzum budur ki, tezliklə bu jurnalın səhifələrində Laçının işğaldan azad edilməsi xəbərini oxumaq xalqımıza qismət olsun.

**İsmayıl MƏMMƏDOV,**
***Azərbaycan Respublikası Prezidenti yanında Dövlət Dil Komissiyasının üzvü, AMEA-nın şöbə müdiri, Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvü, professor***

## SİLAHA SARILAN ÖMÜR

Müasir Azərbaycan tarixində ilk dəfə ölümündən bu qədər uzun müddət sonra şəhid təltif olundu: 203 ay sonra.



Deyirlər, azadlığa o adamlar daha çox layiq olurlar ki, hər gün onun uğrunda döyüşə gedirlər. Güləbirdli gənclər bax o adamlardan idi. Müharibə bütün xofu və dəhşəti ilə ölkəmizin üzərinə şığıyanda laçınlılar, güləbirdlilər də Vətənin müdafiəsinə qalxdılar.

Əvvəlcədən məlum idi – müharibə iki şey diktə edir: ölmək və öldürmək. Ölüm adlı şey isə mütləq son deməkdir və bir də ölüm üçün fərqi yoxdu sən kimsən, ya kim olmusan – oyun bitmişsə şahı da piyada ilə eyni qutuya qoyurlar. …Amma indi ortada Vətən, Vətən və VƏTƏN var idi axı...

1969-cu il martrın 7-də Azad kişinin evində dördüncü oğlan uşağı dünyaya gəldi. Azad kişi atasının adını öz övladına qoymaq qərarına yalnız bu – dördüncü oğlan övladı dünyaya göz açanda gəldi. Bəlkə də bu təsadüf idi, bəlkə də yox. Doğrudur, praqmatik və elmi nöqteyi-nəzərdən yanaşaraq demək olar ki, adlar heç vaxt taleləri yazmır. Amma həyat bəzən bütün, bəli, bütün elmi postulatları alt-üst edir.

Azad kişinin atası Gəray İkinci Dünya müharibəsindən qayıtmayanlardan idi – nə öldüsünü bilən var idi, nə də qaldısını. …Balaca Gəray isə indi doğulmuşdu – onu nə gözlədiyini də hələ heç kim bilmirdi, bilə bilməzdi…

Gəray böyüdü, məktəbə getdi, 1986-cı ildə öz doğma kəndi Güləbirddə orta məktəbi bitirib əsgəri xidmətə yola düşdü. 1987-89-cu illərdə keçmiş SSRİ-nin Petropavlovski, Semfiropol, Sevestopol və Krım vilayətlərində hərbi xidmət keçən Gəray Məmmədov ordu sıralarından rabitəçi rota komandiri-starşina kimi tərxis olundu.

80-ci illərin sonlarında Dağlıq Qarabağ və ətraf ərazilərdə başlanan narahatlıqlar tezliklə Ermənistanın uzun zamandır Azərbaycana qarşı planlaşdırdığı təcavüzü ilə nəticələndi.

Hərbi xidməti başa vurduqdan sonra Laçın rayon DİŞ-də polis starşinası kimi fəaliyyətə başlamış G.Məmmədov həmin vaxt düşmənə qarşı

ilk silaha sarılanlardan oldu. Simasından qorxmazlıq, igidlik yağan Gəray adi bir polis nəfərinə yox, əsl hərbiçiyə, döyüşçüyə, Vətən fədaisinə çevrildi. Bir-birinin ardınca hərbi əməliyyatlarda iştirak edən Gəray döyüş təcrübəsi qazanmaqla yanaşı həm də özünü fədakar döyüşçü kimi sübut etməkdə idi…

**Döyüş yoldaşı Ramiz Əmirovun xatirələrindən:** - Gəray daim axtarışda idi. O, bizimlə söhbətində həmişə deyirdi ki, mən ov tüfəngi ilə vuruşa bilmirəm. Ermənilər avtomatla döyüşür, biz isə ov tüfəngi ilə. Bir gün dedi ki, mən sabah posta gəlməyəcəm – gedirəm rayona polis sıralarına daxil olam. Əlimizdə heç olmasa bir avtomat silahı olsun. Düzünü deyim ki, yoldaşlarım buna şübhə ilə yanaşdılar. Ancaq bir-iki gün sonra Gəray posta polis formasında, çiynində avtomatla gəldi. Elə həmin gündən Gəray Cicimli, Qazıdərəsi, Fərəcan, Güləbird və digər sərhəd kəndlərinin müdafiəsində düşmənə qarşı döyüşməyə başladı. Gərayın iştirak etdiyi döyüşlərdən biri xüsusilə yadımdadır: bizim kənd Ermənistanın bir çox kəndləri ilə həmsərhəd idi. Həmin yerlərdə kənd camaatı əkin işi ilə məşğul olurdu. İşlədiyimiz ərazi “Aralıq yalı” sayılırdı. Bu yer Təzə Xinzirək kəndi ilə yaxın məsafədə həmsərhəd idi…Bir gün günorta vaxtı ermənilər bizi güclü atəşə tutdular. Bizdə olan silahlar yalnız ov tüfəngləri idi, onlarla isə uzaq məsafəni vurmaq mümkün deyildi. Ermənilər isə əməlli-başlı hücuma keçmişdilər. Bu vaxt Gəray özünü bizə köməyə yetirdi. O, bizdən ayrılıb düşmənlə atışmağa başladı və onun fədakarlığı sayəsində qarşı tərəf geri çəkilməyə məcbur oldu.

…25 may 1992-ci il. Laçının işğalından ruhlanan erməni daşnakları növbəti dəfə Güləbirdə həmlə edirlər. Həmin gün kənd ətrafında ağır döyüşlər gedir. Qüvvələr nisbətinin düşmənin xeyrinə olmasına baxmayaraq güləbirdli gənclər əsl direniş göstərərək erməniləri geri oturdurlar. Gərayın başçılıq etdiyi silahlı dəstə ermənilərin 20 əsgərini və iki tankını məhv edir…

Daha bir uğurlu döyüş 1992-ci il oktyabrın 12-də “Qız qəbri” istiqamətində olur. Erməni daşnakları bu dəfə daha geniş çaplı əməliyyatla Güləbirdi almağı qət etmişdi. Bununla belə yenə Gəray və bir neçə döyüşçü yoldaşının döyüş təcrübəsi və uzaqgörənliyi düşmənin planlarını alt-üst edir. Gəray bir neçə döyüşçü dostu ilə düşmənin arxasına keçərək onlara ağır zərbə endirir. Döyüş zolağında 30-a qədər canlı qüvvəsini itirən qarşı tərəf əlacsız halda geri çəkilməyə məcbur olur.

1992-ci ilin iyun ayında Azərbaycan hərbiçiləri Malxələf istiqamətində irimiqyaslı hücuma keçir. Gəray bu döyüşdə də fərqlənir, düşmənin xeyli canlı qüvvəsini məhv edir, “Xəlifə qəbri” deyilən yerdə olan düş-

mən postlarını qumbaraatanla darmadağın edir. Həmin döyüşdə göstərdiyi igidliyə görə Gəraya pul mükafatı təqdim olunur, eyni zamanda Azərbaycan Televiziyasında onun haqqında xüsusi veriliş hazırlanır.

**Döyüş yoldaşı Çingiz Məmmədovun gündəliyindən:**-14.10.1992. Səhər saat 10.00 olar. Kəndin körpüsünə gəlirik. Yenicə çatmışdıq ki, körpünün yuxarısındakı hündürlükdən 10-12 nəfər görünür. Biz də onlara tərəf çıxırıq – Rizvan, İnqilab, Ramiz, Qorxmaz və Çingiz bir tərəfdən, Gəray isə tək bir tərəfdən. Ermənilərlə məsafəmiz lap daralanda güclü atışma başlayır. Gəray fədakarcasına irəliləyir, düşməndə əsl qorxu yaradırdı. Çox keçmir ki, ermənilər Türklər istiqamətində qaçmağa başlayır. Biz onların olduğu yerə çıxırıq.

**Yenə həmin gündəlikdən:**-10.11.1992. Erməni tərəfi yenə də qəflətən Güləbird kəndinə şimal hissədən hücuma keçir. Gəray sürətlə irəliləyən düşmən tankını qumbaraatanla susdurur və onu qənimət kimi ələ keçirir. Düşmən bu hücumda da heç bir şeyə nail ola bilmir, xeyli sayda canlı qüvvə itirərək geri çəkilir. Gəray isə bu döyüşdə ayağından yaralanır.

…Həyat o qədər qəribədir ki! Bəzən "əlvida" deyib gedirsən, amma sonra yenə qayıdırsan, bəzənsə "hələlik" deyib heç vaxt qayıtmırsan. Gəray sonuncu dəfə atası Azad kişi ilə görüşərkən ona hələlik demişdi, tezliklə gələcəyinə söz vermişdi. Amma…

Amma… 1993-cü il avqustun 27-si Gəray üçün son gün oldu, o, qəhrəmancasına şəhid oldu, Vətən üçün yaşadı, Vətən üçün öldü. O, şəhid oldu ki, VƏTƏN YAŞASIN! O, qəhrəmanlıq salnaməsi ilə xatirəyə döndü, əbədi bir xatirəyə…

2010-cu ilin iyulunda Azərbaycan Prezidenti İlham Əliyevin sərəncamı ilə Məmmədov Gəray Azad oğlu "İgidliyə görə" medalı ilə təltif olundu. Müasir Azərbaycanın tarixində şəhid Azərbaycan oğlu ilk dəfə şəhid olmasından bu qədər uzun zaman sonra – 203 ay sonra mükafatlandırıldı. Bu, həm də onun göstəricisi idi ki, doğrudan da adətən deyildiyi kimi, heç kim unudulub, heç kim yaddan çıxmırmış...



**Vüsal MƏMMƏDOV,**
***"168 saat" qəzetinin baş redaktoru***

## LAÇIN RAYONUNUN İLK HƏRBİ TƏYYARƏÇİLƏRİNDƏN BİRİ



Mərhum həmyerlimiz kapitan Vəliyev Füzuli Sabir oğlu 24 fevral 1961-ci ildə Laçın rayonu, Şamkənd kənd inzibati ərazi vahidinin Nağdalı kəndində kəndli ailəsində anadan olub.

1968-ci ildə Nağdalı kənd orta məktəbin I sinfinə getmiş, 1978-ci ildə həmin məktəbi bitirərək bir il kolxozda işlədikdən sonra 1979-cu ilin noyabr ayında hərbi xidmətə yollanmışdır. O, hərbi xidmətini Rusiyanın Omsk vilayətində başa vuraraq doğma Laçın rayonunun Nağdalı kəndinə qayıtmışdır.

Hal-hazırda Prezident təqaüdçüsü, 1966-cı ildən etibarən Sosialist Əməyi Qəhrəmanı adına layiq görülmüş Şərqiyə ana Füzulini Laçın rayon hərbi komissarlığından hərbi xidmətə yola salarkən ona xeyir-duasını vermişdir: “Öz doğma yurdumuza layiq xidmət et!”

Öz doğma anasının tövsiyəsindən və xeyir-duasından bəhrələnən Füzuli hərbi xidmətdən 1982-ci ildə baş çavuş rütbəsi ilə qayıdanda bütün qohumlarını, ata və anasını ürəkdən sevindirmişdir.

Hərbi xidmətini başa vuran Füzuli Vəliyev qəhrəman anası Şərqiyə xanımın və öz əməyinə görə “Oktyabr inqilabı”, “Şərəf nişani” ordenləri və bir çox medallarla təltif olunmuş atası Sabir kişinin də çalışdığı “Kirov” sovxozunda iki il fəhlə işlədikdən sonra ailə qurmuşdur.

1984-cü ildə o, ailə qurduqdan sonra Bakı şəhərinə köçmüş, qədim İçərişəhərdə bərpa işləri ilə məşğul olmuşdur.

Bədnam qonşularımız olan ermənilərin apardığı iyrənc siyasətə dözməyən Füzuli 1988-ci ildə Ağdam rayonuna gəlmiş və orada özünümüdafiə dəstəsinə qoşularaq mənfur ermənilərə qarşı mübarizəyə qalxmışdır. 1990-91-ci illərdə Ağdam, Əsgəran, Xocalı və s. bölgələrdə gedən döyüşlərdə Füzuli igidliyinə və şücaətinə görə fərqlənmişdir. 1992-ci ildə Xocalı şəhəri mühasirəyə düşən zaman Xocalının harayına mülki vertalyotdan birbaşa hərbi helikoptерə keçən polkovnik Xanlar Səttarovla birlikdə Xocalının harayına çataraq bir neçə uçuş zamanı çoxlu sayda soydaşlarımızı xilas etmişdir. Həmin dövrdə Füzulinin qorxmazlığını, igidliyini və vətənpərvərliyini görən təcrübəli pilot polkovnik Xanlar Səttarov onun daha cəsur pilot olacağına şübhə etmir. Beləliklə,

həmyerlimiz kapitan Füzuli Vəliyev 1992-ci ildə polkovnik Xanlar Səttarovun dəvəti ilə Azərbaycan Respublikasının Müdafiə Nazirliyi yanında Uçuş Hazırlığı Təlim Mərkəzinə daxil olur. Bir neçə gün təlim mərkəzində olduqdan sonra Füzuli polkovnik Xanlar Səttarovla birlikdə ön cəbhəyə uçuşlar etmişdir. Qeyd etmək lazımdır ki, Füzuli ilə birlikdə ön cəbhəyə uçuşlar edən Laçın rayonunun Ağanus kəndində anadan olmuş mayor Loğman Məhərrəmov hal-hazırda da öz peşəsi üzrə hərbi mütəxəssisdir.

1993-cü ilin mart ayının sonu, aprel ayının əvvəllərində Kəlbəcər rayonunun işğalı zamanı həmyerlimiz kapitan Füzuli Vəliyev öz pilot yoldaşları ilə birlikdə əhalinin çox hissəsini xilas edərək Yevlax şəhərinə çatdırmışdır. Həmin uçuşların birində ermənilərin atdığı mərmi nəticəsində 68 nəfərin olduğu vertalyot zədə alaraq uçuş qabiliyyətini itirmiş, təcrübəli və cəsur pilotların igidliyi nəticəsində endirilməsinə baxmayaraq iki hissəyə bölünmüşdür. Həmin vaxt 38 nəfər, o cümlədən pilot kapitan Füzuli Vəliyev də ağır yara almışdır. İkinci vertalyotda Loğman Məhərrəmov və Bəhlul Zülfüqarovun köməyi ilə yaralılar oradan Yevlax şəhərinə çatdırılıblar.

Polkovnik-leytenant Bəhlul Zülfüqarovun qeydlərinə əsasən, həmyerlimiz kapitan Füzuli Vəliyev pilot dostları ilə birlikdə 252 döyüş uçuşu etmişdir. Uçuşlar zamanı yaranmış təhlükələr heç vaxt kapitan Füzuli Vəliyevi qorxutmamış, o, öz igidliyini sübut etmişdir.

Cəsur, igid və qorxmaz həmyerlimiz, Laçın rayonundan olan ilk pilotlardan biri kapitan Füzuli Vəliyev 23 noyabr 2003-cü il tarixdə hərbi vəzifəsini yerinə yetirərkən həlak olmuşdur. Hal-hazırda onun həyat yoldaşı və iki qız övladı Bakı şəhərində yaşayırlar.

Laçın rayonunun ucqar dağ kəndində yaşamış, öz əməkləri ilə xalq arasında seçilən, respublika səviyyəsində tanınan və hörmət olunan bir ailənin igid oğlu kapitan Füzuli Vəliyevin xatirəsi daima qədirbilən xalqımızın qəlbində yaşayacaqdır.

**Kərəm CABBAROV,**
***Qarabağ müharibəsi Veteranları,***
***Əlilləri və Şəhid Ailələri İctimai Birliyi***
***Laçın rayon şöbəsinin sədri***

## SULTAN BƏYİN SİLAHDAŞI SEYİD MƏMMƏD



Laçın rayonu tarixlər boyu tanınmış şəxslər, igidliyi ilə seçilən sanballı kişilər yetirmişdir.

Bunlardan tarixi yaddaşlara köçmüş Paşa bəyin övladları Sultan və Xosrov bəylərin bütün türk dünyasının tarixi şəxsiyyətlərinə çevrilməsi danılmaz faktdır.

1918-ci ildə erməni hərbi birləşmələrinə qarşı Xosrov və Sultan bəy qardaşlarının göstərdiyi şücaət təkcə Qarabağı yox, demək olar ki, bütöv Azərbaycanı o dövrdə erməni işğalından qurtarmışdır. Erməni qoşun birləşmələrinin başçısı Andronikin silahlı dəstəsini Zabux dərəsində darmadağın edən Sultan bəy həmin döyüşü yalnız laçınlıların köməyi ilə həyata keçirmişdir. Sultan bəy həmin döyüşdə qalib gəldikdən sonra yaxın silahdaşlarını, döyüşdə və həyatda cəsarəti ilə seçilən dostlarını - Seyid Məmməd, Seyid Əkbər Hacı Mirəziz oğullarını, Çormanlı Uzun Əkbəri (ona çevikliyinə görə Əlik Əkbər də deyərlərmiş), Çal Aslanı, Seyid Həmidi və başqalarını yanına çağırıb "Bununla bizim işimiz bitməyib, Naxçıvan və Ermənistanın tərkibində olan müsəlman kəndləri var ki, ermənilər tərəfindən mühasirədədir. Biz həmin kəndləri azad edə bilməsək də, o bölgədə ağır durumda olan kəndlərin əhalisini mütləq azad etməliyik" - deyir. Həmin bölgəni tanıyan, ordudan qaçıb kömək üçün onlara pənah gətirən adamı göstərir.

315 atıcı döyüşçü onun yaxın dostu və qohumu Seyid Məmmədin tabeçiliyinə verilir.

Seyid Məmməd bundan əvvəl də dəfələrlə ağır tapşırıqlar yerinə yetirməklə özünü cəsarəti və ağılı ilə demək olar bəyin və bütün döyüş yoldaşlarının yanında tanıtmışdır.

Belə ki, hələ döyüş başlamamışdan əvvəl Xosrov bəy Sultanovun Bakıdan Şuşaya aparılması da Seyid Məmmədə tapşırılmışdır. Türkiyədən silah-sursatın gətirilməsi də Seyid Məmməd və Seyid Əkbər qardaşlarına etibar edilmiş, hər iki tapşırıq uğurla yerinə yetirilmişdir. Bundan əlavə Seyid Məmmədin atası, dövrünün varlı hacılarından olan Hacı Mirəziz ağa Paşa bəyin ikinci arvaddan qayınatası idi. Sultan və Xosrovun ana

ayrı, ata bir qardaşları Zülfüqar (Zülü deyilirmiş), Bahadır, Cabbar Seyid Məmmədin maması (bibisi) uşaqları olduğundan, bu şəxslər arasında uşaqlıqdan dostluq, yoldaşlıq münasibətləri yaranmışdır. Biri-birinin cəsarətinə, dərrakəsinə, ağlına, ən əsası etibarına tam bələd idilər.

Bütün bunlara görə həmin vaxt yenə tapşırığa rəhbərlik Seyid Məmmədə tapşırılır. Onlar bələdçini götürərək mühasirədə qalmış soydaşlarına kömək etmək üçün yola düşürlər. Əvvəlcə Sisiyanın bir neçə kəndinin, sonra da Naxçıvanın Sədərəyə yaxın kəndlərinin ermənilər tərəfdən mühasirədə qalmış əhalisini mühasirədən çıxarmağa nail olurlar.

Seyid Məmməd heç vaxt kövrələn adam olmamışdı, ancaq həmin xatirələri danışanda, gördükləri faciələri xatırlayanda gözləri dolar, ağlayardı. Erməni-müsəlman davasından az sonra, Azərbaycanda Sovet hakimiyyətinin qurulması ərəfəsində əvvəlcə Xosrov bəy ölkəni tərk etmək məcburiyyətində qalır. Bir vaxt onun Bakıdan Şuşaya gətirilməsində təhlükəsizliyini təmin edən Seyid Məmməd bu dəfə də sağ-salamat Arazdan adlayaraq İrana keçməsini öhdəsinə götürür və buna çətin olsa da nail olur. Az sonra Xosrov bəyin qardaşı Zülfüqar bəyi də eyni istiqamətdən - Araz çayından İrana keçirir.

Növbə Sultan bəyə gəlib çatır. O, əvvəllər qardaşlarını qınayır, onları töhmətləyir, Vətəni tərk etməyə razılaşmır. Lakin vaxt elə gətirir ki, ölkəsindən getməyə məcbur qalır. Həmin vaxt Azərbaycanın hər yerində vəziyyət ağır idi. Bolşeviklərin azərbaycanlılara qarşı qəddərcasına qətliamlar törətdiyi bir vaxtda Sultan bəyi də xoş aqibət gözləmirdi. Artıq bəyliklər ləğv edilmiş, Sultan bəyin yanından hamı qaçmışdı. Bir neçə etibarlı dost və qohumlarını nəzərə almasaq, həmin vaxtlar ona ən çox sadiq qalanlar Seyid Əkbər və Seyid Məmməd, Uzun Əkbər olmuşdur. O dövrdə Seyid Məmmədin atası tutulub Şuşa türməsinə salınmış, sonralar anası Şamama, bacısı Sayad Qazaxıstana sürgün edilmişdir. Qardaşı Əsgər isə atryad tərəfindən 48 güllə yarası ilə qətlə yetirilmişdir. Bütün bunlara baxmayaraq Sultan bəyi tək qoymayaraq onu Türkiyəyə keçirmək istəmişlər. Seyid Məmməd bir neçə silahdaşı ilə birlikdə bir vaxtlar Türkiyədən silah-sursat gətirmək üçün getdiyi dağ yollarından yenidən istifadə etməklə Mıxtökəndən keçib Dəlidağdan aşır. Arpaçaydan adlayaraq Gülü düzündən, Dik pilləkəndən aşaraq Türkiyəyə keçmək istəsələr də, onların planlarından xəbər tutan bolşevik Ocaqqulu arxalarınca düşür. Cermuxun üstündəki dağda, Sarımsaqlının arxasından axan Kəngərli dərəsinin boğazında, Ala Göllər deyilən ərazidə onlara çatır, atışırlar və Sultan bəyin adamları geri qayıtmaq məcburiyyətində qalırlar.

Oradan atışaraq canlarını qurtaran bəy və başının dəstəsi Seyid Məmmədin o dağlara bələdçiliyinə görə Göyçə torpaqlarında izi azdırırlar, yenidən Laçına – Hacısamlıya, Qarağatlığın meşəsinə gəlib çıxırlar. Müəyyən müddət həmin meşədəki mağaranı rahatlayaraq xalıxalça ilə bəzəyir, bəyi orada saxlayırlar. Sonra Sultan bəyin dostlarından olan kolanılı Qaçaq Arazla əlaqə yaradır, gəlib Əlyanlıda birləşirlər və Sultan bəyi Arazdan keçirməyə nail olurlar. Sultan bəy İranda müəyyən müddət qardaşları Zülü və İsgəndər bəylə birgə yaşayır. Lakin Sovet hökuməti onun orada da yaşamasından narahatlıq keçirir. Ermənilərin əli ilə onu öldürmək üçün xüsusi adam göndərilir. Göndərilən şəxs (tam məxfidir) Sultan bəyi yox, qardaşı İsgəndəri öldürə bilir. Həmin şəxs də Seyid Məmməd tərəfindən öldürülür (bu da tam məxfidir). Bu hadisədən sonra Sultan bəy orada yaşaya bilməyəcəyini dərk edərək böyük Türk dövlətinə üz tutur.

Bundan sonra Seyid Məmməd və qardaşı qaçaq olaraq dağlara çəkilir. Bir neçə ildən sonra Seyid Əkbər tutulur. Mir Cəfər Bağırovun göstərişi ilə Laçında dustaq saxlanan qaçaqları güllələyən zaman Əkbəri də güllələyirlər. Lakin Seyid Məmməd 30-cu illərə qədər qaçaqlıq edir.

Qaçaq olduğu illərdə öldürdüyü başqa qaçaqlar olduğunu nəzərə alaraq hökumət tərəfindən axtarışı ləğv olunur. Lakin həmin qaçaq ləqəbi və keçmişi ilə əlaqədar 70 il Sovet hökuməti tərəfindən təqiblərə məruz qalır. Demək olar ki, bütün növ təqiblərə məruz qalsa da, Kəmər qaya, Cəhənnəm dərəsi adlanan ərazidə 104 yaşında öz əcəli ilə dünyasını dəyişir. El arasında böyük hörmətə, nüfuza malik olmuşdur. Təkcə Laçında Seyid Məmmədə görə 7 qan bağışlanmışdır. Ona təbii savadına görə oxumamış alim və qəhrəmanlığına, dağa söykənib yaşamasına görə Koroğlu Seyid Məmməd də deyərdilər. Pir Seyid peyğəmbər övladı kimi həm də möcüzəli bir seyid idi. O, hökumət tərəfindən nə qədər sıxılsa da, öz nüfuzunu saxlamağa nail olmuşdur. O dövrün hökumət adamları və elm adamları arasında ona xətir qoyan şəxslər çox olardı. Ziyalı təbəqə onunla söhbət etməyi, nəyisə öyrənməyi çox sevərdilər və ona canlı ensiklopediya da deyərdilər.

Çox yaddaşlı bir şəxs idi. Qocalanda da sağlam idi. Demək olar ki, Allahın verdiyi hər şey ölənə qədər ağamda cəm qaldı. Yaddaş, qamət, gözünün nuru, şəxsiyyəti, zəhmi, natiqliyi və s.

Allah hamısına rəhmət eləsin!

**Bayram İBRAHİMOV**

**ZİYALILARIMIZ**



## İBRAHİM ƏHMƏDOV

Əhmədov İbrahim Rəhim oğlu 10 sentyabr 1947-ci ildə Laçın rayonunun Əhmədli kəndində kolxozçu ailəsində anadan olmuş, əvvəl həmin kənd 8-illik, sonra Minkənd kənd 11 illik məktəbində təhsil almış (1962-65), 1966-cı ildə N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) sanitariya-gigiyena fakültəsinə daxil olmuş və 1972-ci ildə oranı bitirmiş, 1972-ci ilin avqustundan 1974-cü ilin fevralınadək Bərdə rayon sanitar-epidemioloji stansiyasında sanitar həkim vəzifəsində çalışmışdır.

14 fevral 1974-cü ildə Elmi Şuranın qərarına əsasən Tibb İnstitutunun Qidalanma gigiyenası kafedrasına assistent vəzifəsinə seçilmişdir. 1986-cı ildə «Müxtəlif tərkib və mənşəli heyvani zülalların zülal mübadiləsinin bəzi göstəricilərinə və stress şəraitində orqanizmin-sinir emosional gərginliyə dözümlülüyünə təsiri» mövzusunda namizədlik dissertasiyası müdafiə edərək tibb elmləri namizədi alimlik dərəcəsinə layiq görülmüş, 1988-ci ildə baş müəllim, 1991-ci ildə isə dosent vəzifəsinə seçilmişdir.

1999-cu ildən Azərbaycan Tibb Universitetinin Qidalanma və kommunal gigiyena kafedrasının müdiridir. 1987-1999-cu illərdə həmçinin tibbi-profilaktika və tibbi-biologiya fakültəsinin dekan müavini vəzifəsində çalışmışdır. 100-dən artıq elmi məqalə, onlarla metodik tövsiyələr və tədris metodik vəsaitlərin müəllifidir.

Səhiyyə Nazirliyinin və Universitetin fəxri fərmanları ilə təltif edilmiş, 2000-ci ildə Respublika Prezidentinin fərmanı ilə "Əməkdar müəllim" fəxri adına layiq görülmüş, 2010-cu ildə isə "Tərəqqi" medalı ilə təltif olunmuşdur.

Universitetin və fakültənin elmi şuralarının, xüsusiləşdirilmiş (dissertasiya) şuranın, sahə metodik komissiyasının, problem komissiyasının üzvüdür. Səhiyyə Nazirliyinin "Qidalanma və mikronutrient çatışmazlığı" üzrə milli koordinatorudur, xalqın sağlamlığının qorunması, «qeyri infeksion alimentar patologiyaların» profilaktikası sahəsində, respublika təşkilatları və beynəlxalq qurumlarda əhalinin qidalanması məsələlərinin koordinasiyası, ərzaq normalarının işlənməsi məsələlərində fəal iştirak edir. Kütləvi informasiya vasitələri ilə qidalanma sahəsində əhalinin maariflənməsi sahəsində mütəmadi və fəal iş aparır.

Ailəlidir, 2 övladı, 2 nəvəsi var.

## HİDAYƏT TAĞIYEV



Hidayət Nemət oğlu Tağıyev 1953-cü il mart ayının 20-də Laçın rayonunun Daşlı kəndində doğulub. 1971-ci ildə sənədlərini Azərbaycan Dövlət Universitetinin (indiki BDU) mexanika-riyaziyyat fakültəsinə verib. Ancaq müsabiqədən keçməyərək hərbi xidmətə yola düşüb və Çelyabinsk vilayətinin Troitsk şəhərində Hərbi Hava Qüvvələrindən Müdafiə batalyonunda əsgəri borcunu yerinə yetirib.

Hərbi xidmətini başa vuraraq 1975-ci ildə BDU-nun mexanika-riyaziyyat fakültəsinin əyani şöbəsinə daxil olan H.Tağıyev 1980-ci ildə həmin fakültəni bitirərək təyinatla Laçın rayonunun Daşlı kənd orta məktəbinə göndərilir, burada riyaziyyat müəllimi və təlim-tərbiyə işləri üzrə direktor müavini işləyir. 1983-cü ildə təyinat müddəti qurtardıqdan sonra Bakı Baş Tikinti idarəsi nəzdində olan Hesablama Mərkəzində mühəndis-proqramçı vəzifəsində çalışır. 1986-cı ildə isə Azərbaycan Müəllimlər İnstitutunda İnformatika və Hesablama Texnikasının Əsasları kabinetində metodist, sonra laboratoriya müdiri, kabinet müdiri kimi fəaliyyət göstərir. 1993-cü ildə "Riyaziyyat dərslərində kompüter texnologiyasının tətbiqi metodikası" mövzusunda dissertasiya müdafiə edərək pedaqoji elmlər namizədi alimlik dərəcəsi alır.

1996-1999-cu illərdə İnformatika və Hesablama Texnikasının Əsasları kafedrasına rəhbərlik edən Hidayət Tağıyev elmi və pedaqoji sahələrdə yaddaqalan uğurlara imza atıb. 14 kitabın, çoxsaylı elmi məqalələrin müəllifidir. Azərbaycan dilində ilk dəfə nəşr olunan ali məktəb tələbələri üçün "İnformatikanın tədrisi metodikası" dərsliyinin müəlliflərindən biridir. "Kompüterin tətbiqi ilə riyaziyyat məsələlərinin həlli"( I və II hissə), "Xırda proqramlar toplusu", "BASİC proqramlaşdırma dili" vəsaitlərinin müəllifidir. 2003 və 2007-ci illərdə ali məktəb tələbələri üçün "İnformatikanın nəzəri və praktiki əsasları"( I və II hissə) dərsliyi tələbələrin ixtiyarına verilib.

Hal-hazırda Azərbaycan Müəllimlər İnstitutunun "Riyaziyyat, İnformatika və onların tədrisi metodikası" kafedrasının dosenti, informatika fənni üzrə fəlsəfə doktorudur.

Müasir texnologiyanın sirlərini tələbələrinə öyrətməklə üzərinə şərəfli bir missiya götürən Hidayət Tağıyev həm də nümunəvi ailə başçısıdır. Vətən üçün layiqli üç övlad böyüdüb: bir oğul, iki qız atasıdır. Eyni zamanda baba olaraq nəvə sevincinin şirinliyini də dadıb.

Ən böyük arzusu isə havasını, suyunu udduğu doğma Laçının işğaldan azad olunduğu günü görmək, bir alim kimi elmi və pedaqoji fəaliyyətini daha uğurla davam etdirməkdir.



## ƏLƏMDAR ŞAHVERDİYEV

1961-ci il noyabrın 2-də Azərbaycan Respublikasının Laçın rayonunun Minkənd kəndində anadan olub.

1979-cu ildə Minkənd orta məktəbini bitirərək ordu sıralarına yola düşmüşdür.

Hərbi xidmətini başa vurduqdan sonra M.Ə.Rəsulzadə adına Azərbaycan Dövlət Universitetinin (indiki BDU) tarix fakültəsinin əyani şöbəsinə qəbul olmuş, 1990-cı ildə universiteti dövlət təqaüdü ilə bitirmişdir.

2004-cü ildə «Trabzon və Batum sülh konfransında Azərbaycan məsələsi» mövzusunda dissertasiya müdafiə etmiş və tarix elmləri namizədi elmi dərəcəsi almışdır.

1991-ci ildən Bakı Dövlət Universitetində çalışan Ələmdar Şahverdiyev 1993-cü ildən Azərbaycan tarixi (humanitar fakültələr üzrə) kafedrasında müəllim işləyir.

Eyni zamanda hüquq, tarix, beynəlxalq hüquq və beynəlxalq münasibətlər, şərqşünaslıq, sosial elmlər və psixologiya, ilahiyyat fakültələrində Azərbaycan tarixi fənnindən mühazirə və seminar məşğələləri aparır.

15 adda elmi əsəri, o cümlədən «Siyasi tarix», «Azərbaycan tarixi», üzrə 3 proqramı nəşr edilmişdir. Əsasən, Azərbaycan tarixinin XIX –XX əsr dövrünü araşdırmaqla məşğuldur. Azərbaycan Xalq Cümhuriyyəti, müstəqil Azərbaycan Respublikasının yaranması və inkişafı məsələlərinə xüsusi diqqət yetirir.

Tədqiqat işində Zaqafqaziya Seyminin Osmanlı Türkiyəsi ilə diplomatik münasibətlərinin tədqiqi mühüm yer tutur.

Respublika Prezidenti Aparatının rəhbərliyi və nəzarəti ilə nəşr olunmuş “Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası”nın müəlliflərindən biridir. “Azərbaycan Xalq Cümhuriyyəti tarixinin aktual problemləri”, “Averilla Qorriman planının Azərbaycana dair müddəaları”,

"Xəzər hövzəsinin tarixinə dair" adlı elmi əsərlərin, eləcə də çoxsaylı məqalələrin müəllifidir.

2009-cu il dekabr ayında İsveçdə İsveç Azərbaycanlıları Federasiyasının dəvəti ilə Stohkolm və Getoburq şəhərlərində "II Dünya müharibəsi illərində Cənubi Azərbaycanda Milli-Azadlıq hərəkatı" adı altında keçirilən Beynəlxalq konfransda iştirak edib.

2010-cu ildə Avropa Komissiyasının Erusmus Mundus proqramı çərçivəsində Fransa Respublikasının Angers Universitetində post-Doktoranturada olub. "Xəzər hövzəsi regionunun Azərbaycanın iqtisadi və siyasi həyatında rolu - XIX əsr, XX əsrin əvvəlləri" mövzusunda fransız dilində doktorluq dissertasiyası müdafiə edib, tarix elmləri doktoru alimlik dərəcəsi üzrə diplom alıb.

2011-ci ildə ali məktəb tələbələri üçün nəşr olunmuş "Azərbaycan tarixi (XIX-XX əsrin əvvəlləri)" dərsliyinin həmmüəlliflərindəndir.

İngilis, fransız, rus dillərini bilən Ələmdar müəllimin fəaliyyəti təkcə elm sahəsi ilə məhdudlaşmır. O, həm də prinsipal vətəndaş mövqeyi, təəssüfkeşliyi ilə seçilən ziyalılarımızdandır. Həmişə hər bir laçınlının probleminə öz problemi kimi yanaşıb. Bütövlükdə xoşbəxtliyimizi torpaqlarımızın işğaldan azad edilməsində görür.




***Ağoğlan məbədi haqqında rəvayət (rəssam Yusif Mirzə)***

***"Laçın yurdu" jurnalı üçün ilk müsahibəni hələ gənc yaşlarından eldə-obada "Alim Məhəmməd" kimi tanınan, indi isə bu adın ən yüksək pilləsinə ucalan AMEA-nın müxbir üzvü Məhəmməd Mehdiyevdən almışdıq.***

***Çox səmimi şəraitdə keçən söhbətimizi yazıya köçürmək istəyəndə çaşıb qaldıq. Müasir səsyazma cihazı bizi pis vəziyyətdə qoymuş, söhbətimizi lent yaddaşında saxlamamışdı. Görünür, dəqiq elmlərin kamil bilicisinin yanında hansısa qeyri-dəqiqliyə yol vermişik. "Ən küt karandaş ən iti yaddaşdan etibarlıdır" deyimini əsas götürüb müsahibəni üzə çıxarmasaq da, alim dostumuz, eloğlumuz Taleh Şirinovun "Dünya şöhrətli laçınlı alim" məqaləsi bizi vəziyyətdən çıxartdı.***

***Eybi yox, Məhəmməd müəllim, borclu borclunun sağlığını istər. 70 illik yubileyinizdə biz sizə adınıza layiq bir müsahibə borclu...***

## DÜNYA ŞÖHRƏTLİ LAÇINLI ALİM



Azərbaycanın təkrarsız gözəlliyə malik bölgələrindən biri olub, bu gün yağı tapdağında inləyən Laçın rayonu tarixən ərlər-ərənlər yurdu kimi tanınıb.

Laçın torpağı eyni zamanda Azərbaycan elminə, Azərbaycan mədəniyyətinə zaman-zaman çox görkəmli simalar bəxş edib. Bu gün adları Azərbaycan coğrafiyasını çoxdan aşmış, təkcə laçınlıların deyil, bütün xalqımızın qürur duya biləcəyi Laçından olan elm adamlarımız Vətən adına şərəfli fəaliyyətlərini davam etdirirlər. Belə tanınmış elm adamlarından biri də işıqlı ziyalı, gözəl insan, böyük alim, əməkdar elm xadimi, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor Mehdiyev Məhəmməd Fərman oğludur.

Məhəmməd Mehdiyev 2 oktyabr 1941-ci ildə Laçın rayonunun Təzəkənd kəndində - kolxozçu ailəsində dünyaya göz açıb. Onun uşaqlığı çox ağır illərə - Hitler Almaniyasının dünyanı qan çanağına döndərdiyi zaman kəsiyinə təsadüf edib. O, hələ iki aylıq körpə olarkən atası da digər Vətən oğulları kimi cəbhəyə yollanıb və bir daha geri dönməyib. Məhəmməd müəllim hələ körpə yaşlarından atasızlığın acısını dadıb, müharibənin gətirdiyi fəlakətlərin şahidi olub, özü kimi «müharibə uşaq-

ları»nın arasında böyüyüb. Mərhum şairimiz Ənvər Rza o dövrün uşaqlarının canlı obrazını çox gözəl yaradıb:

*Uşaqlıq çağımız qəm, kədər görüb,*
*Zülmət gecələrin ümid banıyıq.*
*Uşaqlıq çağımız dəhşətlər görüb,*
*Biz də müharibə veteranıyıq.*

M.Mehdiyev 1951-ci ildə Ərdəşəvi kənd orta məktəbinin birinci sinfinə getmişdir. Orta məktəbdə oxumağa, öyrənməyə olan tükənməz marağı, həvəsi müəllimlərinin də diqqətini çəkib, onun sonrakı təhsil illərində mayaka çevrilib.

Uşaqlıq illəri doğma dağların əsrarəngiz qoynunda keçən Məhəmməd zamanın ağırlığına, həyatın digər çətinliklərinə baxmayaraq xəyallarında gələcək arzularına doğru qanadlanıb.

Orta təhsilini Laçında başa vuran Məhəmməd ali təhsil almaq arzusu ilə Bakı şəhərinə yollanıb. İllərlə çəkdiyi zəhmət də yerdə qalmayıb. İmtahanlardan uğurla çıxaraq o zamankı S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinə (indiki Bakı Dövlət Universiteti) daxil olub. O illərdə rayonlardan gələn uşaqlar daha çox humanitar elm sahələrinə üz tutmağa üstünlük versələr də, Məhəmməd Mehdiyev çətin bir sahəni - dəqiq elmləri özünə həyat yolu seçib. Tələbəlik illərini də boşuna keçirməyib. Yuxusuz gecələr, ağır zəhmət hesabına ali məktəbdə seçilən tələbələrdən olub. Elə bu zəhmətin hesabına da 1966-cı ildə universitetin mexainka-riyaziyyat fakültəsini uğurla başa vuraraq Azərbaycan Elmlər Akademiyasının Riyaziyyat və Mexanika İnstitutunun aspiranturasına göndərilib. Aspirantura hazırlığını isə Rostov Dövlət Universitetində tanınmış alim, akademik İ.İ.Voroviçin rəhbərlik etdiyi Elastikiyyət nəzəriyyəsi kafedrasında keçib. Təbii ki, o zamanlar ucqar bir rayondan gəlib nəhəng ölkənin ən nüfuzlu ali məktəblərindən birində yad dildə təhsil almağın özü insandan böyük zəhmət və güclü iradə tələb edirdi. Bu iradəni isə Məhəmməd müəllim illərlə özündə tərbiyə etmişdi.

M.Mehdiyev Rostovdakı aspirantura təhsilini də uğurla tamamladıqdan sonra 1970-ci ilin yanvarında təyinatla Riyaziyyat və Mexanika İnstitutuna kiçik elmi işçi vəzifəsinə göndərilib. Burada işləyə-işləyə elmi araşdırmalarını da davam etdirib. Bütün çalışmalar sonda öz müsbət nəticəsini verib. 1975-ci ildə Rostov Dövlət Universitetinin elmi şurasında

namizədlik dissertasiyasını uğurla müdafiə edib. Bir il sonra işlədiyi institutda baş elmi işçi vəzifəsinə keçirilib.

Onun gənclik eşqi və böyük zəhmətlə elmə girişməsi təbii ki, institut rəhbərliyinin də diqqətindən yayınmayıb. Məhz ona olan bu etimadın nəticəsində gənc alim 1978-ci ildə «Nazik divarlı konstruksiyalar» şöbəsinə rəhbər təyin edilib. Bu vəzifədə də o özünü istedadlı alim, yüksək səviyyəli ziyalı kimi təsdiq edib.

Məhəmməd Mehdiyevin sonrakı bioqrafiyası da olduqca zəngin və rəngarəngdir. 1985-1991-ci illərdə Riyaziyyat və Mexanika İnstitutunun Xüsusi Konstruktor Bürosunun elmi işlər üzrə direktor müavini vəzifəsində çalışıb. Elə bu illərdə də, elmi fəaliyyətinin diapazonunu daha da genişləndirib. O, 1989-cu ildə Leninqrad (Sankt-Peterburq) Dövlət Universitetində doktorluq dissertasiyası müdafiə edərək, fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsi alıb. 1994-cü ildə isə onun elmi fəaliyyəti yüksək qiymətləndirilərək professor adına layiq görülüb.

Alimin sonrakı elmi və əmək fəaliyyəti Azərbaycan ali məktəblərinin flaqmanı sayılan Bakı Dövlət Universiteti ilə bağlıdır. M.Mehdiyev 1991-ci ildən 2002-ci ilin fevralınadək BDU-nun «Tətbiqi riyaziyyat» kafedrasının professoru vəzifəsində çalışıb.

Məhəmməd müəllim heç vaxt elmin asan yolu ilə getməyib. Onun elmi araşdırmaları ciddi və çətin bir sahəni əhatə edir. Danılmaz faktdır ki, sovet hakimiyyəti illərində Moskvada Azərbaycan alimlərinə çox da isti münasibət olmayıb. Çünki Moskvanın milli ucqarlara, xüsusilə də türk-müsəlman respublikalarına yanaşmasında o meyar əsas olub ki, gərək fövqəladə istedad sahibi olaydın ki, mərkəz hardasa səninlə hesablaşmağa məcbur olsun. Bu baxımdan təsadüfi deyil ki, M.Mehdiyevin apardığı elmi araşdırmalar hələ o illərdə Moskvanın özündə də yuxarı səviyyələrdə etiraf edilib. Bunun nəticəsiydi ki, M.Mehdiyevin aldığı elmi nəticələr 1971, 1975, 1976, 1981, 1983-cü illərdə SSRİ EA-nın Baş Elmi Katibinin məruzəsində mühüm işlər sırasında qeyd olunub. Bundan başqa M.Mehdiyev 1981-1985 ci illərdə «Örtük və lövhələrin statistika, rəqs dayanıqlığı» Ümumittifaq elmi-tətqiqat proqramının rəhbərlərindən biri olub.

Bu gün M.Mehdiyev deformasiyalanan bərk cisim mexanikası sahəsində nəinki ölkədə, onun hüdudlarından kənarda da görkəmli mütəxəssis kimi tanınır. Onun tərəfindən elastikiyyət nəzəriyyəsində yeni «bircins həllər» metodu işlənib hazırlanıb, həmin metodun köməyi ilə ör-

tük və lövhələr üçün elastikiyyət nəzəriyyəsinin üçölçülü məsələsindən ikiölçülü məsələyə keçid problemi öyrənilib.

Bu istiqamətdə elmi araşdırmalar davam etdirilərək örtük və lövhələrin ümumi riyazi nəzəriyyəsi yaradılmış, alınan dəqiq münasibətlər əsasında örtük və lövhələrin klassik nəzəriyyəsinin tətbiq olunma oblastı müəyyən olunmuşdur.

Alimin tədqiqatları bir çox yeni yanaşmalarla da diqqət çəkir. Belə ki, elmi tədqiqat prosesləri zamanı nazik divarlı konstruksiyalarda əvvəllər elmə məlum olmayan yeni dinamik effekt kəşf olunmuşdur. Bununla da xüsusi halda klassik elastikiyyət nəzəriyyəsinin Sen-Venan prinsipinin rəqs tezliyinin müəyyən qiymətindən sonra doğru olmadığı isbat olunmuşdur.

Çoxillik tədqiqatlarının yekunu olaraq alınmış dəqiq nəticələr əsasında M.Mehdiyev tərəfindən örtük və lövhələrin klassik nəzəriyyəsinə əsasən daha dəqiq olan örtük və lövhələrin yeni tətbiqi nəzəriyyəsi verilmişdir. Xatırladaq ki, deformasiyalanan bərk cisim mexanikası sahəsində aldığı fundamental nəticələrlə yanaşı, M.Mehdiyev tərəfindən verilmiş «bircins həllər» metodu diferensial operatorların spektral nəzəriyyəsində, diferensial tənliklərin asimptotik inteqrallama metodunda da ciddi yenilik sayılır.

Son illərdə M.Mehdiyev və tələbələri tərəfindən anizotrop örtüklərin ümumi nəzəriyyəsi yaradılmış, bu nəzəriyyə əsasında mövcud texniki nəzəriyyələrin tətbiq olunma arenası müəyyən edilmişdir.

Məhəmməd müəllim öz ciddi tədqiqatları ilə uzun illər sovet elmində kök salmış saxta erməni mifini də dağıtmışdır. Belə ki, xüsusi halda elmi ədəbiyyatda akademik S.Ambartsumyan nəzəriyyəsinin klassik Kirqof-Lyav nəzəriyyəsinə nəzərən dəqiq olması müddəası onun tərəfindən rədd edilmişdir. Çətinliyinə və mürəkkəbliyinə baxmayaraq S.Ambartsumyan nəzəriyyəsinin klassik Kirqof-Lyav nəzəriyyəsinə ekvivalentliyi də isbat edilmişdir.

M.Mehdiyev öz elmi müddəalarını ən yüksək kürsülərdən də cəsarətlə səsləndirmişdir. O, dəfələrlə örtük və lövhələr üzrə ümumittifaq konfranslarında, SSRİ mexaniklərinin qurultayında, seminarlarında elmi məruzələrlə çıxış etmişdir.

M.Mehdiyev kosmik uçuş aparatlarının təkmilləşdirilməsində və yeni kosmik aparatların yaradılmasında icraçı, məsul icraçı, mövzu rəhbəri və möhkəmlik məsələləri üzrə baş layihə konstruktoru kimi bilavasitə iştirak etmişdir. M.Mehdiyev «Energiya-Buran» sistemində istifadə

olunan daşıyıcı raketin möhkəmlik məsələləri üzrə baş layihə konstruktoru olmuşdur. Kosmik uçuş aparatlarının real şəraitdə sınağı üçün nəzərdə tutulmuş sınaq stendinin müəlliflərindən biridir. O, həmçinin bu illərdə respublikanın bir çox sənaye obyektlərinin çox ciddi sifarişlərini də yerinə yetirmişdir.

Tanınmış alimin müəlliflərindən biri olduğu «Sualtı rezervuar» ixtirası iki dəfə beynəlxalq sərgidə (Dehli, Sofiya) ikinci yeri tutmuşdur.

M.Mehdiyev yeni elmi kadrların yetişdirilməsində də böyük əməyi olan alimlərdən biridir. Hələ keçmiş ittifaqda bir çox doktorluq və namizədlik dissertasiyalarının rəsmi opponenti olmuş, respublikada doktorluq və namizədlik dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşmış şuranın üzvüdür.

M.Mehdiyevin bilavasitə rəhbərliyi altında bu günəcən 17 elmlər namizədi, 2 elmlər doktoru hazırlanmışdır. Hazırda isə 6 aspirant və dissertanta rəhbərlik edir. İki tələbəsi isə doktorluq dissertasiyasını tamamlamaq üzrədir.

Alimin çoxillik və geniş elmi fəaliyyəti beynəlxalq səviyyələrdə də təqdir olunmuşdur. O, Amerika Bioqrafiya İnstitutu tərəfindən 2003-cü ilin adamı hesab olunmuş, 2004-cü ildə isə həmin institut tərəfindən elm və bəşəriyyət qarşısında xidmətlərinə görə qızıl medala layiq görülmüşdür.

Amerikanın «Albert Helson Marqus» fondu tərəfindən çap olunan «Dünyanın görkəmli adamları» ensiklopediyasının 23-cü cildində Məhəmməd Mehdiyev haqqında ətraflı məlumat verilmişdir. Alim 2010-cu ildə Amerika Bioqrafiya İnstitutu tərəfindən «Öz ölkəsini dünyada şöhrətləndirən adam» nominasiyası üzrə qızıl medala layiq görülmüşdür. Eyni zamanda İngiltərənin Kembric Universiteti tərəfindən böyük elmi nailiyyətlərinə görə «Lenardo Da Vinçi almazı» medalı ilə təltif olunmuşdur.

M.Mehdiyevin elmi yaradıcılığı öz ciddi sanbalı ilə yanaşı olduqca məhsuldardır. Professor çap olunmuş 90 (xaricdə və respublikada) əsərin, eyni zamanda keçmiş ittifaqın qapalı mətbuatında çap olunmuş bir çox əsərlərin müəllifidir.

M.Mehdiyev Bakı Dövlət Universitetinin Böyük Elmi Şurasının üzvüdür. Bakı Dövlət Universiteti nəzdində fəaliyyət göstərən N02.016 Dissertasiya Şurasının sədridir.

Alimin çoxillik və dəyərli elmi fəaliyyəti ölkənin elmi ictimaiyyəti tərəfindən də yüksək qiymətləndirilmişdir. M.Mehdiyev 30 iyun 2001-ci

ildə Azərbaycan Milli Elmlər Akademiyasına mexanika ixtisası üzrə müxbir üzv seçilmişdir.

M.Mehdiyev zəngin elmi tədqiqatlar, geniş ictimai fəaliyyətlə yanaşı, həm də ciddi rəhbər kadr kimi tanınır. O, 2002-ci ilin fevralında «Tətbiqi analizin riyazi üsulları» kafedrasının müdiri vəzifəsinə seçilmiş və hazırda həmin kafedranın müdiridir. 7 yanvar 2008-ci ildən isə Tətbiqi riyaziyyat və kibernetika fakültəsinin dekanı seçilib. 1993-cü ildən Yeni Azərbaycan Partiyasının üzvüdür.

M.Mehdiyev 30 sentyabr 2009-cu ildə Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə «Əməkdar elm xadimi» adına layiq görülmüşdür.

Məhəmməd müəllim bir alim, bir müəllim, bir elmi rəhbər kimi, bir insan kimi istedadlı, əvəzsiz və qayğıkeşdir. Onu səciyyələndirən cəhət el adamı olmasıdır. O, üstünə gələn, kömək istəyən hər kəsə əl tutmağa, qayğı göstərməyə çalışır. Bu böyük ürəkli insan bir vətəndaş kimi ümumxalq, dövlət əhəmiyyətli işləri öz şəxsi işindən həmişə üstün tutur.

Böyük alim, gözəl ziyalı Məhəmməd Mehdiyev bu gün ömrünün və elmi-ictimai fəaliyyətinin ən qaynar, məhsuldar bir dövrünü yaşayır. Bu il ölkənin elmi ictimaiyyəti tanınmış alimin 70 illik yubileyini qeyd etməyə hazırlaşır. 70 ilin zirvəsindən boylananda isə arxada zəhmətlə və şərəflə yaşanmış bir ziyalı ömrünün səhifələri göz önündən gəlib keçir. Biz də onun bir yetirməsi olaraq Məhəmməd müəllimi bu gözəl yubiley münasibəti ilə ürəkdən təbrik edir, ona möhkəm can sağlığı, ailə xoşbəxtliyi və anamız Azərbaycanın çiçəklənməsi yolunda yeni-yeni zirvələr arzulayırıq. Arzu edirik ki, tanınmış alimimizin, vətənpərvər ziyalımızın yubiley sevinclərini doğma Laçında da yaşaya bilək.



**Taleh ŞİRİNOV,**
***Azərbaycan Texniki Universitetinin dosenti, riyaziyyat üzrə fəlsəfə doktoru***

## KİMLƏR KEÇDİ BU DÜNYADAN

### ŞAHVERDİ ŞAHVERDİYEV



Təkcə yaşadığı rayonda deyil, ətraf bölgələrdə də böyük nüfuz sahibi olan Şahverdiyev Şahverdi Niftalı oğlu 10 avqust 1911-ci ildə Laçın rayonunun İmanlar kəndində doğulub. 1928-ci ildə Şuşada Realnı məktəbə daxil olub. 1932-ci ildə təhsilini başa vurduqdan sonra Laçın rayonunun Şəlvə Zəhmət məktəbinin müdiri vəzifəsinə təyin edilib. 1935-ci ildən Hacıxanlı kənd məktəbində müdir vəzifəsində çalışıb. 1939-cu ildə Bakı şəhərində 2 illik Müəllimlər İnstitutuna daxil olub, 1941-ci ildə institutu bitirib və hərbi xidmətə çağırılıb.

Orduda tərxis olunduqdan sonra pedaqoji fəaliyyətini davam etdirib. 1947-ci ildən Laçın rayonunun Vağazin kənd 7 illik məktəbinə direktor təyin olunub. 1954-cü ildə SSRİ Ali Soveti tərəfindən qüsursuz işinə görə medalla təltif olunub.

Müxtəlif illərdə Laçın rayon Ali Məhkəmənin Şəlvə sovetliyi üzrə səyyar iclasçısı işləyib və dəfələrlə rayon sovetinin deputatı seçilib. 1980-ci ildən Maarif Nazirliyinin qərarına əsasən ona Baş müəllim adı verilib.

2004-cü ildə vəfat edən Şahverdi Şahverdiyevin xatirəsi el-obada həmişə əziz tutulur.

Bir haşiyəyə də çıxım ki, Rafiq müəllimin dostu, kəndimizin ən sevimli şairi Şahmar Əkbərzadə el-obamızın müdrik ağsaqqalı Şahverdi dədə obrazını ədəbiyyata gətirərək bədiiləşdirib. Bu ifadəm bir az təəccüblü görünə bilər. Çünki Şahmar Əkbərzadə Azərbaycanın ən çox sevilən şairlərindəndir. “Kəndimizin ən sevimli şairi” deyəndə mən onu kiçiltmirəm. Əksinə, kiçik bir dağ kəndini, bu kəndin sadə insanlarını necə böyük məhəbbətlə vəsf etdiyini yada salıram. “O dağlara yanan gərək” deyib haray çəkən şair sözün həqiqi mənasında bizim yerlərin vurğunuydu.

**BAYRAM İBADOV**



Laçın rayonunun çox dəyərli ziyalılarından biri də İbadov Bayram Əliş oğlu idi. O, 1942-ci ildə Budaqdərə kəndində anadan olmuşdur. Uşaqlığı müharibə illərinə düşən Bayram bütün çətinliklərə baxmayaraq təhsilə, elmə böyük maraq göstərmişdir. Birinci sinifdən 7-ci sinfə qədər qonşu Hacıxanlı kənd məktəbində oxumuş, sonra təhsilini doğma kəndindən 10-15 km məsafədə yerləşən Kürdhacı kənd orta məktəbində davam etdirmişdir.

Orta təhsilini başa vuraraq 1961-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki BDU) "Əmtəəşünaslıq və sənaye malları ticarətinin təşkili " fakültəsinə daxil olmuş və 1966-cı ildə universiteti yüksək qiymətlərlə bitirmişdir.

Bundan sonra da təhsildən ayrılmamış, elmə daha dərindən yiyələnmək üçün aspiranturaya daxil olmuş və 1969-cu ildə aspiranturanı bitirərək məqsədinə çatmaqdan ötrü daha bir addım atmışdır.

1972-ci ildə isə dissertasiya müdafiə edərək iqtisad elmləri namizədi elmi dərəcəsi almışdır.

1976-cı ildə Q.V.Plexanov adına Moskva Xalq Təsərrüfatı İnstitutunda "Ticarətin İqtisadiyyatı" ixtisası üzrə tam kurs keçmişdir.

1984-cü ildə SSRİ Ali Attestasiya Komissiyası tərəfindən ona ticarətin iqtisadiyyatı kafedrası üzrə dosent elmi dərəcəsi verilmişdir.

Çoxlu sayda elmi məqalələrə imza atan Bayram İbadov əmək fəaliyyətinə Q.Bünyatzadə adına Xalq Təsərrüfatı İnstitutunda laborant olaraq başlamış, sonralar "Ticarətin İqtisadiyyatı"kafedrasında müəllim, baş müəllim, assistent vəzifələrində işləmişdir.

1987-ci ilin aprel ayında haqq dünyasına qovuşan Bayram İbadovun ruhu yəqin ki, narahat deyil. Çünki həyatının davamı olan övladları atalarının adını həmişə uca tutmuşlar.

İki oğul, iki qız yadigarı Azərbaycan Dövlət İqtisadiyyat Universitetinin məzunudurlar. Qızları Reyhan və Kəmalə, oğlu Elçin maliyyə-kredit fakültəsini, böyük oğlu Əliş isə uçot-iqtisad fakültəsini bitirərək savadlı mütəxəssis kimi yetişmişlər.



## ƏFQAN CƏBRAYILOV

Qarabağ müharibəsi zamanı böyük fədakarlıqlar göstərmiş tanınmış həkim Əfqan Cəbrayılov 1948-ci il 1 iyunda Laçın rayonunun Ələkçı kəndində anadan olub. Ə.Cəbrayılovun mənsub olduğu nəsil Qarabağın və Zəngəzurun məşhur Qasımuşağı nəslidir. Bu nəslin görkəmli nümayəndələri həmişə Azərbaycanın ictimai-siyasi həyatında mühüm yerlər tutmuşlar. Xosrov bəy Sultanov, Sultan bəy Sultanov məhz Qasımuşağı nəslindəndir. 1918-1920-ci illərdə ermənilərin Qarabağa hücumlarının qarşısının alınmasında bu nəslin nümayəndələri igidliklə vuruşmuşlar.

Ə.Cəbrayılov 1957-ci ildə Şamkənd kənd orta məktəbində birinci sinfə getmiş, beşinci sinfə qədər təhsilini bu məktəbdə davam etdirmişdir. Orta təhsilini 1967-ci ildə Mingəçevir şəhərində başa vurmuşdur. Elə həmin il Azərbaycan Tibb İnstitunun (indiki Azərbaycan Tibb Universiteti) müalicə-profilaktika fakültəsinə daxil olmuşdur.

1973-cü ildə ali təhsilini başa vuran gənc həkim 1 il interna keçir, 2 il sovet hərbi sıralarnda hərbi həkim kimi xidmət edir, ehtiyatda olan kapitan rütbəsində tərxis olunur.

Əfqan Cəbrayılov 1976-cı ildə öz doğma yurduna - Laçın rayonuna qayıdır və Şamkənd xəstəxanasına baş həkim təyin edilir. İşlədiyi dövrdə rayon rəhbərliyi qarşısında məsələ qaldırmış, 1979-cu ildə yetmiş beş çarpayılıq yeni xəstəxananın tikilməsinə nail olmuşdur.

Ə.Cəbrayılov səhiyyə əlaçısı idi. "Sosializm yarışının qalibi", "Əməkdə fərqlənməyə görə", "Səhiyyə əlaçısı" medalları, müxtəlif fəxri fərman və diplomlarla təltif olunmuşdur.

1992-ci ildə Laçın rayonunun mərkəzi hissəsi və bir çox kəndləri işğal olundu. O zaman Ə.Cəbrayılov Laçında qalan yeganə həkim idi və AzTV vasitəsi ilə rayon rəhbərliyinə, ordu bölmələrinə Laçına qayıtmaları üçün müraciət etmişdir.

1993-cü il aprelin 3-də Kəlbəcərin işğalı zamanı Laçında yaşayan insanlar doğma yurdlarını məcburi tərk edərkən erməni quldurlarının mühasirəsinə düşdülər. Bu insanlar arasında Ə.Cəbrayılov və həmkəndliləri də var idi. Mühasirədən azad olmaq üçün gedən vuruşlardan Ə.Cəbrayılov sağ çıxsa da, bir çox həmyerliləri şəhid oldu, bir çoxları isə əsir düşdülər.

Ə.Cəbrayılov sonrakı fəaliyyətini Qax rayonunda davam etdirdi. 1994-cü ildə Qax rayonunun Tasmalı kənd xəstəxanasına baş həkim təyin olunmuş, yüksək bilik və bacarığına görə böyük hörmət qazanmışdır. Rayonda bir həkim kimi ən çox ona və rəhbərlik etdiyi xəstəxanaya müraciət olunduğu üçün Amerika şirkətinin Azərbaycan nümayəndiliyi tərəfindən kənddə yeni ambulator bina inşa edilmişdir.

Azərbaycanın bütün rayonunda məskunlaşan laçınlılar Əfqan həkimə daim müraciət edirdilər.

Həyatının sonuna qədər Qax rayonunda yaşayan Əfqan Cəbrayılov 13 mart 2010-cu ildə vəfat etmişdir.

Ə.Cəbrayılovun üç övladı var. Böyük və ortancıl oğlu hüquqşünas, kiçik oğlu həkimdir, atasının yolunu davam etdirir.

## QARA SEYİD



Sadıqov Sadıq Abbas oğlu 1900-cü ildə Laçın rayonunun Böyük Seyidlər kəndində anadan olub. El arasında “Qara Seyid” adı ilə tanınmışdır. 1952-ci ildə Böyük Seyidlər kəndindən Şəlvə Sovetliyinin Qovuşuq kəndinə köçmüşdür. 1981-ci il avqustun 22-də rəhmətə gedib və həmin kənddə dəfn olunub.

4-cü imamın - İmam Zeynalabiddinin kökündəndir. Qarabağ bölgəsində hər kəsin iman gətirdiyi Qara Seyidin nəvəsi Ağa da el-obada babasının xeyirxah əməllərini yaşadan mömin bir şəxs kimi hörmət sahibidir.

## ZİYALILARIMIZ



### HƏKİM OLMAQ UŞAQLIQ ARZUSU İDİ

Laçın yurdunun ziyalı şəxslərindən biri də Mürsəl Həmidovdur.

Həmidov Mürsəl Lələkişi oğlu 1952-ci il dekabrın 25-də Laçın rayonunun Lolabağırlı kəndində dünyaya göz açıb. 1971-ci ildə Qorçu kənd orta məktəbini bitirib. 1972-1974-cü illərdə hərbi xidmətdə olub. 1974-1975-ci ildə Bakı Dəniz Limanında fəhlə işləyib.

Hələ şagird olduğu vaxtlarından, daha dəqiq desək, V sinifdən həkim olmaq istəyi onu 1975-ci ildə N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) gətirib çıxarır. Elə həmin il I müalicə-profilaktika fakültəsinin tələbəsi adını qazanır.

1981-ci ildə institutu bitirir və internaturasını Bakı şəhər 14 saylı Tibbi Sanitar Hissədə keçir.

1982-ci ildə Mürsəl Həmidovu Bakı Şəhər Baş Səhiyyə İdarəsinin göndərişi ilə Bakı Şəhər Təcili və Təxirəsalınmaz Tibbi Yardım Stansiyasına işə göndərirlər. Burada o səyyar həkim kimi 1984-cü ilə qədər işləyir.

1984-1992-ci illər ərzində Sabunçu, Əzizbəyov (indiki Xəzər) və Yasamal rayonlarında köməkçi Təcili Tibbi Yardım Stansiyalarında müdir vəzifəsində çalışır.

1992-ci ildə Bakı Şəhər Təcili və Təxirəsalınmaz Tibbi Yardım Stansiyasına baş həkimin müavini təyin olunur. 2007-ci ildən isə bu günə qədər Bakı Şəhər Təcili və Təxirəsalınmaz Tibbi Yardım Stansiyasının baş həkimidir.

Mürsəl Həmidov 1984-cü ildə Leninqrad (indiki Sankt-Peterburq) Hərbi Tibb Akademiyasında iki ay müddətində təhsil almış, 1990-cı ildə isə Moskva şəhərində ixtisasartırma kursu keçmişdir. 1990, 1995 və 2008-ci illərdə tibbi xidmətlə əlaqədar olaraq İran İslam Respublikasında, İsraildə və Yaponiyada ezamiyyətdə olmuşdur.

1992-ci ildən Yeni Azərbaycan Partiyasının üzvü və eyni zamanda idarədə ilk təşkilatın sədridir.

Müxtəlif illərdə əməyi fəxri fərman, medal və fəxri adla qiymətləndirilib. 1995-ci və 2005-ci illərdə Azərbaycan Respublikası Səhiyyə Nazirinin "Fəxri fərman"ı, 2006-cı ildə isə Azərbaycan Respublikası Prezidenti tərəfindən "Tərəqqi" medalı ilə təltif edilib. 2008-ci ildə Prezidentin fərmanı ilə "Əməkdar həkim" adına layiq görülüb. 2010-cu ildə

Bakı Şəhər İcra Hakimiyyətinin "Fəxri diplom"u, Fövqəladə Hallar Nazirliyinin "Yubiley medalı" ilə də təltif olunub.

Mürsəl Həmidov həm də gözəl ailə başçısıdır. Həyat yoldaşı Gülsənəm xanım Bakı Dövlət Universitetinin məzunudur. Hal-hazırda evdar xanımdır.

Böyük oğlu Samir Azərbaycan Respublikası Prezidenti Yanında İdarəçilik Akademiyasını bitirib. Siyasi elmlər namizədidir. Bakı şəhəri, Nəsimi rayon bələdiyyəsində çalışır.

Kiçik oğlu Zaur isə Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin məzunudur. Azərbaycan Həmkarlar İttifaqı Konfederasiyasında işləyir.

**Elnur MEHDİYEV,**
***AYB-nin, AJB-nin üzvü, "Qızıl qələm" mükafatı laureatı.***

## TƏBRİK



### Jurnalın qayəsi ümummilli, ümumrespublika, ümumislam ruhunda olsun

"Allahdan bir arzum var ki, huşumu əlimdən almasın" deyimi dillərindən düşməyən ulularımızın, hər şeylə razılaşan ulularımız yaddaşımızın itirilməsinə razı olmayıblar. Bu gün dəyərli jurnalist dostumuz Arif Məmmədlinin "Laçın yurdu" dərgisini nəşr etdirmək niyyəti elə yaddaşımızın qorunmasına yönələn bir təşəbbüsdür. Qorxduğumuz-yaddaşımıza xələl gəlməsi! Təskinliyimiz-balalarımızın qan yaddaşının möhkəmliyi.

Tam hissələri ilədir. Laçınsız tam, bütöv Azərbaycan yoxdur. Hər bir hissə tamın modelidir. Elə Laçın da Azərbaycan modelidir. Üzümü Arif Məmmədliyə tutub deyirəm: "Yaddaşı saxlamaq, bərpa etmək tibbdə asan olmadığı kimi, xalqın yaddaş məsələsi olan dərginizin də yolu asan olmayacaq! Nikbin ol! Qoy jurnalın qayəsi ümummilli, ümumrespublika, ümumislam ruhunda olsun. Jurnalınızın uğur qazanacağına bəri başdan inanıram. İnanıram, ona görə ki, sizə inanıram. Fikrim jurnalınızın ünvanına xoş sözlər deyib kənara çəkilmək yox, əməli işdə kömək etməkdir.

Ən azı çiyinlərinə müstəqillik yükünü götürən vətəndaşlarımızın sağlamlığına yönələn tibbi məqalələrlə çıxış etməyə boyun oluram.

Bu jurnalın Azərbaycan ailələrinə ayaq açması yolunda kömək edə biləcək şəxslərə öz minnətdarlığımı bildirirəm.

**Nağdəli KEŞTƏKLİ,**
***ATU-nun dosenti***



## KNYAZ MƏMMƏDOV

Knyaz Şiraslan oğlu Məmmədov 1950-ci ildə Laçın rayonunun Alxaslı kəndində müəllim ailəsində anadan olmuşdur. 1967-ci ildə Bakı Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinə daxil olub, 1972-ci ildə oranı bitirmişdir. Bundan sonra təyinatla Azərbaycan Milli Elmlər Akademiyasının Kibernetika İnstitutuna göndərilmiş, 1973-1976-cı illərdə orada əyani aspiranturada oxumuşdur. 1981-ci ildə Belarus Respublikasının Minsk şəhərində dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi elmi adını almışdır.

1976-1993-cü illərdə AMEA-nın Kibernetika İnstitutunda kiçik elmi işçi, baş elmi işçi və laboratoriya müdiri vəzifələrində işləmişdir. 2007-ci ildən fizika-riyaziyyat elmləri doktorudur. 1994-cü ildən etibarən indiyədək Bakı Dövlət Universitetinin Tətbiqi Riyaziyyat və Kibernetika fakültəsində professor vəzifəsində işləyir. O, eyni zamanda Azərbaycan Milli Elmlər Akademiyasının Kibernetika İnstitutunda da "Diskret Optimallaşdırma Modelləri və Üsulları" şöbəsinin müdiridir və həmin institutda riyaziyyat, texnika və iqtisadiyyat üzrə doktorluq müdafiə şurasının elmi katibidir. 2004-cü ildən ABŞ riyaziyyatçılar cəmiyyətinin "Əməliyyatlar tədqiqi" bölməsinin üzvüdür. Bununla yanaşı, professor K.Ş.Məmmədov ABŞ-da nəşr olunan bir neçə nüfuzlu elmi jurnalın ekspertidir.

Əsas elmi fəaliyyəti riyazi kibernetika, diskret optimallaşdırma, iqtisadi-riyazi modelləşdirmə, əməliyyatlar tədqiqi və ədədi üsullarla bağlıdır. Həmin sahələrə aid 100-dən artıq elmi əsəri Azərbaycanın, Rusiyanın, Ukraynanın, Latviyanın, Almaniyanın və ABŞ-ın qabaqcıl elmi jurnallarında çap edilmişdir. Onun aldığı elmi nəticələr Azərbaycanın və keçmiş SSRİ-nin müxtəlif yerlərində praktiki tətbiqini tapmışdır. Bunlardan dəniz neft-qaz yataqlarının istismarı zamanı platformaların optimal yerlərinin tapılması və onların müxtəlif kommunikasiya xətləri ilə optimal birləşdirilməsi məsələsi Azərbaycan Dövlət Neft Şirkəti tərəfindən qəbul olunmuş və müxtəlif yataqlara tətbiq olunmuşdur. Bundan əlavə, professor K.Ş.Məmmədovun çoxsaylı obyektlər arasından optimal seçmə ilə bağlı işləyib hazırladığı riyazi modellər və onların həll üsulları Moskva səhərindəki bir hərbi hissədə müvəffəqiyyətlə tətbiq olunmuşdur.

Qeyd edək ki, professor K.Ş.Məmmədov "çətin həll olunan" məsələlər sinfinə aid olan diskret optimallaşdırma məsələlərinin müxtəlif si-

nifləri üçün yeni effektiv həll üsulları işləmiş və bu nəticələr çoxsaylı beynəlxalq və respublika elmi konfranslarında məruzə olunmaqla yanaşı, müxtəlif xarici elmi jurnallarda çap olunmuşdur.

Son illərdə onun aldığı elmi nəticələrdən ikisi daha mühüm əhəmiyyət kəsb edir. Bunlardan birincisi tam ədədli çox məchullu tənliyi, ona ekvivalent olan sadə tənliklər sisteminə gətirmək üçün təklif etdiyi üsuldur. Qeyd edək ki, bu məsələ ilk dəfə 1972-ci ildə ABŞ riyaziyyatçıları tərəfindən qoyulmuş, lakin 30 ilə yaxın müddətdə həll olunmamışdır. Professor K.Ş.Məmmədov bu məsələni dünyada ilk dəfə olaraq əvvəlcə "Bul" dəyişənləri halında, sonra isə daha ümumi şəkildə həll edərək ABŞ-da və Ukraynada nəşr etdirmişdir. İkinci elmi nəticə isə diskret optimallaşdırma məsələlərində optimal həlli saxlayan kiçik oblastın tapılmasıdır. Bu nəticə, baxılan məsələnin optimal həllinin verilmiş oblastda deyil, yalnız onun müəyyən kiçik hissəsində axtarmağa imkan verir.

Professor K.Ş.Məmmədov ali məktəb tələbələri üçün 2 dərs vəsaitinin ("İqtisadi kibernetikadan mühazirələr" və "Alqoritmlər nəzəriyyəsindən məsələlər") və öz elmi kəşflərindən ibarət rus dilində yazılmış 430 səhifəlik bir monoqrafiyanın ("Методы решения различных классов задач дискретной оптимизации") müəllifidir. Onun elmi rəhbərliyi ilə 5 nəfər müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi, bir nəfər isə riyaziyyat üzrə fəlsəfə doktoru elmi adını almışdır.

Knyaz müəllim həyatını dəqiq elmlərə bağlasa da, poeziyanı çox sevir və yeri gələndə duyğularını şeirə çevirir.

**Həsrətindəyəm**

Alxaslının payız çağı,
Şirindir balı, qaymağı.
Bala qatıb nehrə yağı,
Çalmağın həsrətindəyəm.

Zövq alardıq hər çiçəkdən,
Çəməndəki kəpənəkdən.
Yaşıl otlu biçənəkdən,
Çalmağın həsrətindəyəm.

Şən olsam da dönə-dönə,
Vətənsizlik dərddir mənə.
Gedib Alxaslıda yenə,
Olmağın həsrətindəyəm.

O günlərim keçib necə,
Yadımdadır bircə-bircə.
Alxaslıda bircə gecə,
Qalmağın həsrətindəyəm.

Meşə bulağına çıxıb,
Oradan Əzgüllüyə qalxıb.
Dağılmış kəndimə baxıb,
Dolmağın həsrətindəyəm.

## Yaman yaraşırdıq bir-birimizə

Bir gün bir məclisdə üz-üzə gəldik,
Baxışlar görüşdü, göz-gözə gəldik.
Elə bil dünyaya biz təzə gəldik,
Məhəbbət yol açdı ürəyimizə,
Yaman yaraşırdıq bir-birimizə.

Görüşdük utana-utana bir gün,
Hərdən danışırdın, hərdən gülürdün.
Mən sənə baxanda yana dönürdün,
Qızartı çökmüşdü üz-gözümüzə,
Yaman yaraşırdıq bir-birimizə.

Sözlərim sözünə uyğun gəlirdi,
Gözlərim gözünə uyğun gəlirdi,
Özüm də özünə uyğun gəlirdi.
Ehtiyac yox idi artıq bir sözə,
Yaman yaraşırdıq bir-birimizə.

Bir gün bir namərdin felinə düşdün,
Zəng etdim dinmədin, nə də görüşdün.
Özünə tənhalıq yolunu seçdin,
Kimin gözü dəydi görəsən bizə?!
Yaman yaraşırdıq bir-birimizə.

O vaxtdan könlümdə bir nisgilim var,
Həmişə sinəmi didib parçalar.
Nə sən günahkarsan, nə mən günahkar,
Ayrılıq yazıldı taleyimizə,
Ancaq yaraşırdıq bir-birimizə.

**XATİRƏ**

## ÖLÜMSÜZLÜYÜN MÜBARƏK
*Dostum Ağa Laçınlının xatirəsinə*



Mayası halallıqdan yoğrulmuşdu. Şeirimizin, sözümüzün ağır kişilərindən idi Ağa Laçınlı. Ağır oturub, batman gəlməyi sevərdi. Sadəlik, səmimiyyət, sözün həqiqi mənasında təvazökarlıq boyuna biçilmişdi. Sözünün, sovunun yerini bilməyənlərdən, boş dağarcıq kimi şişənlərdən, yersiz, mənasız-mətləbsiz hay-küy qoparanlardan xoşu gəlməzdi.

Doğulub boya-başa çatdığı dağlar kimi vüqarlı, əzəmətli görkəmi vardı. Qayğılı görünər, fikirli gəzərdi. Geniş alnında düyünlənən qırışlar keçdiyi çətinliklərdən, keşməkeşli ömür-gün yolundan xəbər verirdi.

Halallıqla böyütmüşdü övladlarını. Oğlanları qürur mənbəyi idi. Fəxrinin, Oqtayın, Azərin yelinə uçurdu. Təbiətin özü kimi təbii idi. İllərlə yol yoldaşı olmuşduq. Rayonlara gedər, şeir oxuyar, məclislər keçirərdik.

- Ay Musa, rayona, kəndə gələndə özümə dönürəm – deyirdi. – Şəhərdə elə bil adam özü olmur, kimisə yamsılayır, hansısa rolun ifaçısına dönür. Ə, vallah adam bu qoyunlu-quzulu çöllərdə ölüb qalmaq istəyir.

Bu sözləri elə içdən, elə yanğılı deyirdi ki...

Tanışlığımızın qırx ilə yaxın bir tarixçəsi vardı. Mən Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsinin axşam şöbəsində ikinci kursda oxuyanda Ağa müəllim də dekanlıqda işə düzəldi.

İlk tanışlığımız dostluğa çevrildi. Mənim şeir yazdığımdan xəbər tutan Ağa Laçınlı (Həmin vaxtlar artıq iki-üç kitab müəllifi idi. Şair kimi tanınırdı) bir-iki şeirimi dinləyəndən sonra:

- Ə, sən əməlli-başlı şairsən, darıxma, vaxt gələcək çap da olunacaqsan, məni öz qardaşın bil. Nə sözün-sovun olsa çəkinmə, əlimdən gələn köməyi səndən əsirgəmərəm – demişdi.

Demişdi və elə həmin vaxtdan da istəyini, məhəbbətini ürəyimə köçürmüşdü. Mən Ağaya arxalanırdım. Ağa çətin günün dostu idi. Mən "Gənclik" nəşriyyatına redaktor düzələndə buna ən çox sevinənlərdən biri də dostum Ağa Laçınlı idi. Mətbuatda çap olunan şeirlərimi diqqətlə oxuyar, həmişə öz fikrini bildirərdi.

Aramızda on ildən artıq yaş fərqi olsa da məni özünə tay-tuş eləmişdi. Möhkəm zarafatımız vardı. İbrahim Kəbirlidən, Hüseyn Arifdən yaddaşında özü ilə bağlı qalan lətifələri arabir danışar, qəşş edənə qədər gülərdi və məni də güldürərdi. Mən hərdən ona “Ağa müəllim” deyə müraciət edəndə “Ə, müəllim özünsən” deyib onun nəzərində “bu soyuq” rəftara xitam verərdi. Yaxşı yolluğu vardı. Səfərdə dostlarına xoş ovqat bəxş edərdi. Sadə idi, səmimi idi.



Rəsmiyyətdən qətiyyən xoşu gəlməzdi. Bir dəfə, gərək ki, Daşkəsənə getmişdik. Katib bizi hörmət və ehtiramla qarşıladı. Raykomda təşkilat şöbəsinin müdiri işləyən ucaboy, son dərəcə rəsmi görüntülü bir kişini çağırdı və bizi təqdim elədi. “Şairlərin görüşlərini yüksək səviyyədə təşkil edərsən, özlərini də darıxmağa qoymazsan, indi qışdır, dağlarımız qarla örtülüdür, ancaq dağda böyüyən şairlərimiz üçün bunun elə də fərqi yoxdur, daha da xoş olar, uşaqlıq illərini təzədən xatırlayarlar. Həm də görsünlər bu qarda-çovğunda biz nələr çəkirik”.

Ağa müəllim katibin sözlərini zarafatla cavablandırıb aramızda bir səmimiyyət körpüsü saldı.

- Filankəs müəllim – dedi – nə çəkdiyinizdən xəbərdarıq. Əlbəttə, kef çəkirsiniz, halal xoşunuz olsun, bizim kimi dərd çəkəsi deyilsiniz ki... Amma bizi elə adama tapşırın ki, bir az başqa olsun, özümüzü rahat hiss edək.

Katib bu sözdən azca tutulsa da, bir qəhqəhə çəkdi və dedi ki, Ağa müəllim, sizi müşayiət edəcək Lətif müəllim elə siz deyən adamdır, mənim yanımda özünü boğmağına baxmayın. Bilirəm nə deyirsiniz, özünü

çəkənlərdən, "oxlovudan"lardan deyil. Əsl həyat adamıdır. Bir də ki, sizi kimə etibar etmək artıq mənim səlahiyyətimdir.

Daşkəsəndə dörd gün maraqlı görüşlərimiz keçdi, hər görüşün sonunda da qonaqlıq, sağlıqlar, zarafatlar... Lətif müəllim bizə elə qaynayıb-qarışmışdı ki... Görüşlərdə oxuduğumuz şeirlərin bir neçəsini də əzbərləmişdi. Ancaq ayrılanda məni kənara çəkib dedi:

- Musa müəllim, deyəsən axı siz öz iş yerlərinizi mənə yanlış dediniz. Ağa müəllim nəşriyyatda işləyir, siz də universitetdə, eləmi?

Mən Ağa müəllimi çağırdım, Azərbaycan Dövlət Universitetinin dünya ədəbiyyatı kafedrasının müəllimi olduğunu sənədiylə təsdiqlədi. Lətif müəllim Ağa müəllimi təzədən bağrına basdı, onun bu qədər sadə, səmimi, öz diliylə desək, "kəndçi" olduğuna heyrət elədiyini bildirdi. Bu dörd gün Ağa müəllimə öz kəndçiliyini, qoyun-quzu otardığı uşaqlıq illərini qaytarmışdı. Ağa müəllim özünə, yaddaşına qovuşmuşdu Daşkəsənin qarlı dağlarında...

Ağa Laçınlı ilə hər görüşümüzdə o günləri xatırlayır, onunla bağlı gülməli xatirələri çözələyirdim. Bir dəfə belə görüşlərin birində o, çox kədərli və tutqun tərzdə dedi:

- Ə, Musa, bunları yaz də, nə vaxt yazacaqsan, mən öləndən sonra?!

Mən onu bu ovqatdan çıxarmaq üçün bir zarafat elədim... Rəfiq Zəkanın Tələt Əyyubova dediyi sözləri təkrarladım: "Ağa, - dedim, - qorxma sən ölən deyilsən, bəlkə o xatirəni də mənim haqqımda özün yazası oldun". İndi bu gün o görüşü, o anı xatırlayıb peşmançılıqla kövrəlirəm, ürəyimdən qara qanlar axır, doğrudanmı Ağanı itirmişik, doğrudanmı onun ölümündən bir il keçir?!

Niyə mən özü dediyi o günlərdə bu xatirələri dilə gətirmədim? Sağlığında yazsaydım başqa cür yazacaqdım, dadını-duzunu, sumağını, istiotunu azaltmadan, əskiltmədən...

Nə bilim vallah, görünür çox şey adamın özündən asılı deyil.

Bir dəfə də Kürdəmirə ezam olunmuşduq. Ədəbiyyatı təbliğ bürosunun xətti ilə. Kupeyə bilet almışdıq. Axşam qatara mindik. Kupe yoldaşlarımla birlikdə yeyib-içdik. Bir az xumarlanmağımız Ağanı təşvişə saldı: "Musa, - dedi – vallah-billah biz yatıb qalacağıq, bir də görəcəyik ki, ya Şəmkirdəyik, ya Tovuzda. Bir dəfə mənim başıma gəlib belə şey. Bax, ayıq ol, bələdçi də çox içdi, gedən kimi başını atıb yatacaq". Mən də, bələdçi də Ağa müəllimi nə qədər arxayın salmaq istəsək də, o, elə dediyini dedi.

Təzəcə yerimizə uzanmışdıq ki, xırda bir çimirdən sonra Ağa yerindən dik atılıb kupenin pəncərəsinə boylandı:

- Ə, Musa, tez dur, Kürdəmiri ötürük.

Mən durub bələdçiyə yaxınlaşdım, o, “Heç Ələtə çatmamışıq” dedi. “Gedin rahat yatın, mən sizi oyadacam”.

Gəldim, bu sözləri ona çatdırıb təzədən yerimə uzandım və məni dərhal yuxu apardı. Bir də gördüm Ağa məni yenidən silkələyir:

- Ə, Musa, dur, Kürdəmir...

Kupe yoldaşlarımız da oyandılar. Təzədən bələdçiyə üz tutduq və beləliklə, bu hadisə on-on beş dəfə təkrar olundu. Artıq əsəbiləşmişdik. “Ağa, - dedim, - beynim xarab olub, keçərik keçərik, gedərik Gədəbəyə, Tovuza...” Axır yalvarmağa başladım: “Sən Fəxrinin canı...” Ağa bu dəfə lap sakitləşdi və “Ə, yatıb qalsaq sənnəndi ha, geri qayıtmaq pulumuz, yeməyimiz və bütün xərclər...” Mən razılaşıb təzədən yerimə uzandım, nə qədər keçdiyini bilmirəm, yenə də o məni səslədi, bu dəfə çox asta və həlim: “Ə, Musa, ə, Məlik müəllimin canı üçün, Fəxrinin canı üçün növbəti stansiya Kürdəmirdi, tez elə gör geyinə bilirsənmi, çatdıra bilməsək də paltarlarımızı tez yığışdıraq, vaqonda heç nəyimiz qalmasın!”

Mən cəld durdum, şalvarı, pencəyi zorla geyindim, jiletim, paltom, şərfim, sumkam əlimdə qapıya çatdım. Qatar artıq dayanmışdı, sərnişinlərdən biri: - Tez olun düşün – dedi. – Bu saat qatar tərpənəcək.

Hər ikimiz cəld yerə atıldıq. Başıbatmış bələdçi kupesində xorna çəkirdi, onu oyatmaq, nəsə soruşmaq müşkül məsələ idi.

Qar yağırdı, yer su və palçıq idi. Yerdə biz düşən vaqonun qapısında bir milisioner və bir neçə adam var idi. Ağa müəllim soruşdu, ə, qardaş, bura Kürdəmirdi? Onlar təsdiqləyəndən sonra Ağa müəllim üzünü mənə tutub:

- Ə, oynamayanın eləsi-beləsi belə-belə...

Və özü də hər iki qolunu qaldırdı, əlindəki sumkanı, paltonu yerə buraxdı. Mən də ona qoşuldum, paltomu, şərfimi, sumkamı sulu, palçıqlı yerə atdım və baxıb gördüm ki, yanımızdakı adamların hamısı oynayır, milisioner də içində. Qatar artıq tərpənmişdi, yanımızdan ötəndə qonşu vaqonun bələdçisi bu səhnəyə baxıb şaqqanaq çəkdi:

- Ə, bircə zurnanız, balabanınız çatmır – dedi.

Biz yerdən palçığa bulaşmış paltarlarımızı götürəndə milisioner yaxınlaşıb astadan:

- Vətəndaş, hər ikiniz mənimlə gedəcəksiniz – dedi.

Görünür Ağa müəllimin başına qoyduğu panama onu ehtiyatlandırmışdı, ona görə də sözünü mənə deyirdi. Biz paltomuzun palçığını təmizləyə-təmizləyə tez-tələsik geyinib stansiyaya doğru irəliləyəndə milisioner təzədən mənə:

- O tərəfə yox, bu yana mənim ardımca gəlin – dedi.

Ağa müəllim bu dəfə onun sözlərinin fərqinə vardı deyəsən, ucadan və onun eşidəcəyi bir tərzdə:

- Musa, bu səfeh milisioner nə deyir, görünür bizi kiminləsə səhv salıb.

Milisioner qəzəblə:

- Ay yoldaş, özünüzü yığışdırın, yoxsa başınızdakı panamaya da baxmaram.

- Ə, səfeh, baş-ayaq danışma, qabağıma düş raykomun binasını göstər bizə. Qonaqnan belə danışmazlar.

Milisioner səhvini dərk elədi deyəsən, qabağa düşdü və çox sakit, az qala yalvarıcı bir tərzdə:

- Müəllim, indi gecə saat dörddür, raykomda kim olasıdır ki...

Ağa müəllim gülə-gülə:

- Onda bir isti yer tap. Böyük nəçənniksən, yemək-içmək təşkil elə. Kürdəmirdə rastlaşdığımız ilk kürdəmirli sənsən, biz də Kürdəmirə qonaq gəlmişik. Şairlərik, panama da səni hürkütməsin. Ə, Ağa Laçınlının adını eşitmisənmi?

Milisioner:

- Eşitmişəm nədi, şeirlərinizi də oxumuşam, Ağa müəllim, xoş gəlmisiniz. Sizin oğlunuza yazdığınız o şeiri bizim toylarda müğənnilər hamısı oxuyur.

Bəxtimiz gətirmişdi. Milisioner ədəbiyyat maraqlısı idi. Bizi "koçeqar" binasına gətirdi, beş dəqiqənin içində qatıq, qaymaq, çörək tapdı, pürrəngi çay dəmlətdirdi. Sonra da heyran-heyran Ağa müəllimin zarafatlarına qulaq kəsildi.

Ağa müəllim belə Ağa müəllim idi, uşaqla uşaq, böyüklə böyük…

Bir dəfə də Yevlaxa birgə getmişdik. Mənim bir köhnə dostum (o zaman kolxoz sədri işləyirdi) bizi gördü, Yevlaxda olmağımıza çox sevindi. Məni çəkib dedi ki, Musa müəllim, axşam saat yeddidən sonra mənim qonağımsınız. Raykomun qonaq evinə özüm arxanızca gələcəm. Xahiş edirəm, heç yana getməyin, məni gözləyin!

Dediyi vaxtda gəldi. "Villis" maşınına əyləşib xeyli uzağa getdik. Bir çöllü-biyabanda rayonun hörmətli kişilərindən biri bir kababxana açmışdı. Dostumun dediyinə görə, bura rayonda ən "pristijni" yer idi. Ona görə ki, burda çox vaxt ov ətindən kabab verirdilər. Kababxananın müdiri dostuma və bizə olan hörmətindən özü bizə xidmət edirdi. Əvvəlcə çöl donuzu kababı gətirdilər. Yeməklə doymaq olmurdu. Biz araq içirdik. Ancaq Ağa müəllim konyakı seçdi. Kabab yaman xoşuna gəlmişdi. Xəlvətcə məndən soruşdu: - Ə, Musa, bu nə ətidi?

Dedim:

- Ağa, ömrün boyu qoyun-quzu otarmısan, bə görmürsən ki, quzu kababıdı.

- Ə, vallah, – dedi – bizim quzular belə dadlı olmurdu, bu Yevlağın quzuları nə yaman dadlıymış…

Mən gördüm ki, konyak öz işini görməkdədi. Bir eyham elədim ki, Ağa, bütün bunlara konyak günahkardı, yoxsa sən belə soruşmazdın. Az qala pıçapıçla dedi ki, ə, narahat olma, heç bunun iki butulkası da mənə kar eləməz.

Bir az keçəndən sonra həqiqətən də quzu kababı gətirdilər. Ağa müəllim ilk tikəni götürüb məndən soruşdu.

- Ə, bu nə ətidi?

- Bərəkallah! – dedim – yenə seçə bilmirsən, ə, nə əti olacaq, qaban ətidi də, çöl donuzu əti.

Ağa tikəni nimçəyə atıb kababın ikinci buludunu süfrəyə qoyan kişiyə, kababxananın müdirinə:

Dostum, yaman dadanmısan qabana,
Yoxsa, ehsan verəcəksən babana?

- demişdi ki, kişinin mətbəxə qaçmağı, iri bir çörək bıçağı götürməyi bir oldu…

Artıq söz deyilmişdi. Güllə kimi öz hədəfini deşib keçmişdi.

Ətrafımızdakıları güldürmək amacı ilə, adicə zarafat təbiri ilə deyilsə də. Mən və dostum tez kişinin dalınca qaçdıq, üzr istəmək, dil tökmək, hətta yalvarmaqla müşayiət olunan söhbətimiz, nəhayət, öz bəhrəsini verdi. Ancaq deyim ki, bütün bunlardan Ağa müəllim xəbərsiz oldu. Konyak onu tamam tutmuşdu. Kişi pərt halda öz "Qaz-24"-nə əyləşib getdi. Məclisimizsə gecəyarıya kimi davam etdi. Səhər bu hadisəni Ağa müəllimə danışanda onu gülmək tutdu: "Ə, görürsənmi – dedi – söz necə şeydi, düz deyiləndə, məqamında deyiləndə hətta ölümlə də mükafatlandırıla bilər. Bə şair olmaq budu də, gərək sözünü yerində deyəsən, məqamında tutuzdurasan".

Ağa müəllim sözünü deyən insan idi, şeirləri, poemaları o zamanın müdhiş senzurasından, "Qlavlit" deyilən baş idarədən çətinliklə keçərdi.

Mən artıq altı-yeddi ilə yaxın idi ki, "Gənclik" nəşriyyatında redaktor işləyirdim. Yaşımız otuzu haqlayırdı. Evim yox idi deyə evlənə bilmirdim. Musabəyov qəsəbəsində Qanlıgölün sahilində ev tikib məskunlaşan bir qohumum həyətində mənim üçün də yer ayırmışdı. Bir "gecəqondu" qaralamaq lazım idi. Lakin bu iş olduqca yasaq idi. Milis işçiləri aman vermirdilər. Bu işi görməyi, milislərlə dil tapmağı Ağa müəllim öz boynuna götürdü. Bir gün birlikdə müdrik ağsaqqalımız, Azərbaycanın xalq yazıçısı Əli Vəliyevin – Əli Qara oğlunun evinə yollandıq.

Əli müəllim hər ikimizin dostu idi. Onu da deyim ki, mən sarıdan bu dostluğun təməlini də Ağa müəllim qoymuşdu. Mənim televizorda çıxışımı dinləyən Əli Qara oğlu şeirlərimdən xoşu gəldiyini Ağaya danışır, Ağa da o ki var məni tərifləyir və Əli müəllimə deyir ki, Musa ilə bir gün yanına gələcəyik. Əli müəllimlə dostluğumun təməli, bax, beləcə qoyulmuşdu. Mətləbdən uzaqlaşmayım, Ağa müəllimlə Əli Vəliyevin evinə gəldik. Ağa müəllim orda işləyən (Musabəyov qəsəbəsində) rəis müavininin Qubadlıdan olduğunu və həmin adamın Əli müəllimin sözündən çıxa bilməyəcəyini xatırlatdı. Həmişəki kimi Əli müəllimin söhbəti çox ötkəm və kəsə oldu:

- Ağa Laçınlı, – dedi – bunu mənə deməsən də olardı, elə özün də gedə bilərdin. Hüseyn Kürdoğlunu da götür, get o rəis müavininin yanına, de ki, Musa Ələkbərli evlənməlidi. Yaşı ötür, “Gənclik” nəşriyyatında arvadların-qızların içindədi. Allah eləməmiş, əlindən bir xata çıxar, biabır olarıq.

Mən qıpqırmızı qızardım, pərtlikdən yanaqlarım od tutub yanırdı. Ağa müəllim qəhqəhə çəkib gülür, Əli müəllimlə lap tay-tuşu kimi zarafatlaşırdı.

Səhərisi gün xətrini dünyalarca istədiyimiz Hüseyn Kürdoğlu, Ağa Laçınlı və mən rəis müavininin yanında olduq. Məsələ yoluna qoyuldu. 1978-ci ilin noyabr ayında qohumumun mənə ayırdığı yerdə gecənin birində bir otaq – gecəqondu yapa bildik və bu gecəqondu mənim və şair qardaşlarım Bəhlul Ataxallının, Gəray Göyyurdun gələcək taleyində demək olar ki, həlledici rol oynadı. Üçümüz də bu balaca evdən pərvazlanıb ev-eşik olduq.

Ağa Laçınlı bizim böyük qardaşımız idi. Bir xeyli aradan keçəndən sonra qardaşım Bəhlulla bu evə çarpayı, kitab şkafı və televizor almaq üçün mağazaya yollananda yolda Ağa müəllimə rast gəldik. Harasa bərk tələssə də o bizi buraxmadı:”Ə, mən də sizinlə gedim, – dedi – sizi aldatmasınlar, bir isbatlı şey alaq”. Hələ onu unutdum deyəm ki, gecəqondunun inşa olunduğu o gecə Ağa müəllimin xahişi ilə filologiya fakültəsinin axşam şöbəsinin altı-yeddi tələbəsi də mənim köməkçim oldu. Hə, Ağa müəllim bizimlə getdi, həqiqətən də iki yaxşı çarpayı, bir kitab şkafı, bir dənə də ağ-qara televizor aldıq. Gəldik çarpayıları, şkafı yerbəyer elədik, televizoru quraşdırıb süfrə açdıq. İlk dəfə bu evdə Ağa müəllimin qardaş xeyir-duasını eşitdim. Ağa müəllim burda mənə Gədəbəyə getməyimizi, kənddəki birotaqlı ata evimizi xatırlatdı və “Musa, – dedi – indən sonra var qüvvənizi cəmləşdirib kənddə əməlli-başlı bir ev tikdirin. Qohumdan-qonşudan seçilmək, geri qalmaq çətindir, xüsusən də kənd yerində. Allah qoysa gedərik, görərsən qardaşım Əliylə birlikdə biz də Oğul-

dərədə yaxşı bir ev tikdirdik. Məlik müəllim o az maaşıyla sizi böyüdüb, oxudub, siz də o kişini el-oba içində sınmağa qoymayın".

Ağa müəllimin bu sözləri qulağımızda sırğa oldu. Aradan üç-dörd il keçəndən sonra kəndimizdə dördotaqlı, geniş dəhlizli, şüşəbəndli böyük bir ev inşa etdirdik. Atamın-anamın fərəhi yerə-göyə sığmırdı. İndi bu sətirləri yazdığım zaman o günlər üçün burnumun ucu göynəyir. Onu da deyim ki, Ağa müəllimin kiçik qardaşı Əli sifətcə mənə çox oxşayırdı. Birgə oxuduğumuz universitet illərində müəllimlərin və uşaqların bəzisi məni Ağanın qardaşı sayırdılar. Ağa müəllim bundan xəbər tutanda "Elə hər ikisi mənim qardaşımdır" deyərdi.

Eh, nə yazım, Ağa ilə bağlı xatirələrim bitib-tükənməzdir, bir yazıya, beş yazıya sığası deyil. Mən bu yazıya nöqtə qoymaq istəyəndə Ağanın o sözləri yenidən qulaqlarımda səsləndi. O sanki indi deyirdi: "Ə, Musa, yazsan bu xatirələri. Bəs nə vaxt yazacaqsan? Bəlkə mənim dirilib qayıtmağımı gözləyirsən?!" Mənsə ona xəyalən cavab verirəm: Sən ölməmisən, Ağa Laçınlı, sən yaşayırsan, şeirlərinlə, o təmiz, büllur şəxsiyyətinlə, sonsuz xeyirxahlığınla, dosta-qohuma yanımcıllığınla, duzlu-məzəli zarafatlarınla, ağır-ciddi görkəminlə, hər məni görəndə "hələ mən kəsə deyirəm", "sözün qısası" deyə uzatdığın söhbətlərinlə… O söhbət söhbət xatirinə olmurdu, o söhbət cani-dildən gəlirdi, ürəyinin tac damarından süzülürdü. Sən doğmalıq mücəssəməsiydin, Ağa Laçınlı…

Yerin behişt, torpağın qu tükündən yumşaq olsun. Səni torpaq dərdi əritdi. Sən Ağa Laçınlı idin, Laçınsızlığa dözə bilməzdin! Anan haqq dünyasına qovuşanda "Anam anasından ayrı yatır" deyib kövrəlməyin bu gün də gözlərimin qabağındadır. Balalarından nigaran getməyin də məni yaman ağrıtdı. Gərək onların toyunu görərdin, gərək nəvələrin başına toplaşaydı, gərək onların sayını itirəydin…

Bu "gərək"lərin hamısını sadalasam "sözün qısası"ndan qisas almalıyam. Hələlik, Ağa Laçınlı! Mənim şair qardaşım, mənim kimi səni yaxından tanıyanlar ölümünə heç vaxt inanmayacaqlar. Sən ölüm körpüsünü keçib ölümsüzlüyə qovuşdun, Ağa Laçınlı! Ölümsüzlüyün mübarək, əbədiyyətin uğurlu olsun!



**Musa ƏLƏKBƏRLİ**
***Şair-publisist***
***16 yanvar 2009-cu il.***

**ƏMƏKLƏ UCALANANLAR**

## Qırxqızın “qırx birinci” qızı

Vəliyeva Şərqiyə Əkbər qızı 1936-cı ildə Laçın rayonunun Piçənis sovetliyinin Qırmızıgüney kəndində anadan olmuşdur. Onlar ailədə 4 bacı, 1 qardaş olublar.

Atası Əkbər 1941-ci ildə müharibəyə getdikdən sonra anası onları Laçın rayonunun məşhur “Kirov” sovxozuna köçürmüşdü. Şərqiyyə burada anası ilə birlikdə sağıcı işləyirdi. Uzun müddət sağıcı işlədikdən sonra 1966-cı ildə ən yüksək ada layiq görülüb. “Qızıl ulduz” və “Lenin” ordeni ilə təltif olunub. Sonrakı illərdə ikinci dəfə “Lenin” ordeni ilə, “Şərəf nişanı”, “Oktyabr inqilabı”, “Qırmızı əmək bayrağı” və “Xalqlar dostluğu” ordenləri və bir çox medallarla təltif olunmuşdur.



***Tərlan Musayeva və Şərqiyə Vəliyeva***

Moskva kənd təsərrüfatı sərgisinin üzvü olub. Bir qızıl, bir gümüş və iki bürünc medal alıb. Azərbaycanda keçirilən bir neçə Qurultayın nümayəndəsi olub. Hətta 30-cu qurultayda Azərbaycan Respublikasının ulu öndəri mərhum prezidenti Heydər Əliyevlə yaxından görüşüb xatirə şəkli çəkdirib. Və həmin vaxt Heydər Əliyevi Laçın rayonuna dəvət etmişdir.

O zaman Heydər Əliyev Azərbaycanın qədim şəhəri olan Şuşadan qayıtmışdı. Təbiətin şıltaqlığından Laçına gələ bilməmişdi.

Laçın rayon Şamkənd sovetliyindən olan öz tələbə yoldaşı Vəliyev Sabir Talış oğlu ilə ailə qurub. Ailəliklə maldarlıqla məşğul olublar. Həyat yoldaşı Vəliyev Sabir "Oktyabr inqilabı" ordeni, "Qırmızı əmək bayrağı" ordeni, "Şərəf nişanı" ordeni və bir neçə orden və medallarla təltif olunmuşdu.

Qızlarının üçü onunla birlikdə sağıcı işləmiş və onlar da orden və medallarla təltif olunmuşlar. Oğlanlarının beşi də sovetlər birliyində hərbi xidmət keçiblər. Oğlanlarından dördü Qarabağ uğrunda gedən döyüşlərdə yaxından iştirak ediblər və hal-hazırda Qarabağ veteranlarıdırlar. Oğlu Vəliyev Füzuli Azərbaycan Respublikasının Hərbi hava qüvvələrinin Mİ-24 helikopterində pilot olmuşdur. 252 dəfə bomba tökməyə uçuş almışdı və göstərdiyi cəsurluğa görə kapitan rütbəsinə layiq görülmüşdür. Onun döyüş zamanı aldığı yara və zədələrdən sonra 2003-cü ildə noyabr ayının 23-də hərbi vəzifəsini yerinə yetirərkən həlak olmuşdur.

1992-ci ildə mənfur qonşularımızın apardığı çirkin siyasətin nəticəsində doğma Laçınımızdan didərgin düşmüş, hal-hazırda Azərbaycanın qədim şəhərlərindən olan Bərdə şəhərinin Zümürxan kəndində məskunlaşmışdır. Bərdə rayonunda doğmalıq görsə də, elsiz-obasız, Laçınsız yaşamaq çətin olub. 1997-ci ildən YAP-ın üzvüdür. 2002-ci ildən ulu öndər Heydər Əliyevin sərəncamına əsasən ona prezident təqaüdü verilib. Ulu öndərin davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin apardığı siyasəti ürəkdən dəstəkləyir və alqışlayır.



**VETERANLARIMIZ**

## CƏMŞİD TAĞIYEV

Cəmşid Tağı oğlu Tağıyev 16 may 1926-cı ildə Laçın rayonunun Avazlar kəndində anadan olub. İlk təhsilini kənddə alıb, orta məktəbi isə Laçın şəhərində bitirib. Böyük Vətən Müharibəsi illərində bir müddət kolxozçu işləyib.



*Cəmşid Tağıyevin Prezident İlham Əliyevlə görüşü. 2009-cu il*

1944-cü ildə Laçın rayon Hərbi Komissarlığı tərəfindən hərbi xidmətə göndərilib. İlk xidmətə Dağıstan MSSR-nın Bunyaqsk şəhərində başlayıb. 1945-ci ilin mart ayında 2-ci Ukrayna cəbhəsinin 7-ci qvardiya ordusunun 5-ci mexanikləşdirilmiş polkunun tərkibində Rumıniya, Avstriya və Çexoslavakiyanın Bratıslav-Brno əməliyyatındakı döyüşlərdə və Brno-Praqa şəhərlərinin azad edilməsində iştirak edib.

Döyüşlərdə iştirakına görə orden və medallarla təltif olunub.

Qələbədən sonra 1947-ci ilin dekabr ayının axırına kimi Çexoslavakiya, Almaniya və Macarıstanda, 1948-1949-cu illərdə isə Leninqrad (Sankt-Peterburq) hərbi dairəsində xidmətini davam etdirib.

Ordudan tərxis olunduqdan sonra Xankəndi Müəllimlər İnstitutunu və M.F.Axundov adına Azərbaycan Dövlət İnstitutunun rus dili və ədəbiyyatı fakültəsini bitirib. 1952-ci ildən fasiləsiz olaraq müəllim işləyir.

1954-cü ildən 1972-ci ilə kimi Laçın rayon Maarif Şöbəsində metodist-inspektor vəzifəsində çalışıb, eyni zamanda Laçın Pedaqoji Məktəbində və orta məktəbdə dərs deyib. “Baş müəllim”, “Ali kateqoriyalı müəllim” adlarını alan Cəmşid Tağıyev bir çox metodiki məqalələrin müəllifidir.

Məcburi köçkün kimi Bakıda məskunlaşan Cəmşid müəllim sözün əsl mənasında bir ziyalı ailəsinin başçısıdır. Ömür-gün yoldaşı Mina xanım universitet bitirib. Övladları Aybəniz, Ədibə, Gülbəniz, Eldar, Azər və Elxan ali təhsillidirlər.

Çoxillik müəllimlik təcrübəsini, təşkilatçılıq bacarığını, 58 illik pedaqoji fəaliyyətini təkcə övladlarının deyil, gənclərimizin təlim-tərbiyəsinə sərf edən Cəmşid müəllim onların Vətənə layiqli vətəndaş olmaları üçün əlindən gələni əsirgəməyib. Öz taleyindən çox razıdır, hər dəfə sinfə girib dərs dediyi şagirdlərlə ünsiyyət quranda elə bilir ki, ömrünə ömür calanır. Məzunların uzaq-yaxın xaricdə xoş sorağını eşidəndə sevincinin həddi-hüdudu olmur.

Müasir təhsilin tələblərini nəzərə alaraq şagirdlərə bütün yaş mərhələlərində bir şəxsiyyət kimi yanaşmağın, onların istək və arzularına, təkliflərinə xüsusi diqqət göstərməyin tərəfdarıdır.

- Gənclərin təlim-tərbiyəsi, həyat mövqeyinin müəyyən edilməsi xalqımızın ictimai inkişafının mühüm tərkib hissəsidir, - deyən Cəmşid Tağıyev müəllim əməyinin müqəddəsliyindən böyük həvəslə danışır:

- Tədris ocaqlarında əsas sima müəllimdir. Bu şərəfli peşənin sahibləri təkcə dərs dediyi fənni ustalıqla tədris etməsi ilə yox, həm də sadə davranışı, təvazökarlığı, ümumi mənafeyini şəxsi mənafedən üstün tutmaları ilə fərqlənirlər.

Sözün tam və böyük mənasında müəllim o kəslərə deyilməlidir ki, şagirdin, tələbənin içindəki insanlıq işığını vaxtında görsün, onu inkişaf etdirib formalaşdırsın...

## BİR AİLƏ TANIYIRAM



Bir ailə tanıyıram. Mayası halallıqdan, zəhmətdən yoğurulan bir ailə.

"Ailə kiçik dövlətdir" ifadəsi sanki haqqında söhbət açacağım bu ailənin boyuna biçilib. Bu kiçik dövlətin başçısı Şəlvə dərəsində uşaqdan-böyüyə hər kəsin yaxşı tanıdığı və hörmət bəslədiyi Şiraslan Salahovdur. Ömür-gün yoldaşı Seyid Səltənətlə birlikdə 12 övlad-10 oğul, 2 qız böyüdüblər, 50-dən artıq nəvə-nəticələri var.

Onların həyat yolu hamar olmayıb. Böyük bir ailənin ehtiyacını ödəmək üçün çətin sınaqlardan keçiblər. Təsərrüfatın ən ağır sahəsi olan qoyunçuluqla məşğul olublar. Amma halal zəhmət həmişə öz bəhrəsini verib. Uşaqlıqdan əməyə alışan ailənin kiçik üzvləri belə ailənin başçısına dayaq durublar. Necə deyərlər, üzərlərinə düşən övladlıq borcunu şərəflə yerinə yetiriblər, nankor çıxmayıblar.

Bəlkə də özlərini ən elit ailə hesab edənlərin həsəd apardığı tərbiyənin nəticəsidir ki, bu ailənin bütün üzvləri həmişə torpağa, Vətənə bağlılıqları ilə seçiliblər. Müstəqil dövlətimizin qurulmasında da əllərindən gələni əsirgəməyiblər.

Qorxmaz, Elmixan, Qalib, Qabil Salahov qardaşları Laçın, Şuşa, Ağdam, Ağdərə və Füzuli istiqamətində gedən döyüşlərdə erməni qəsbkarlarına qarşı mərdliklə vuruşublar.

Bu gün də bədənində 9 qəlpə yarası gəzdirən polis mayoru Qalib Salahov dövlətimizin güc strukturlarında çalışır.

Yeri gəlmişkən xatırladım ki, ötən əsrin 80-ci illərində Şiraslan kişinin oğlu, uşaqlıq dostum, o vaxt 11 kəndi birləşdirən sovxozun komsomol komitəsinin katibi Əli Salahovla birlikdə " Zirvə" adlı divar qəzeti çıxardırdıq. O dövr üçün çox cəsarətli hesab olunan tənqidi yazılara üstünlük verirdik. Qeyd edim ki, sovxoza tanınmış bir alimin rəhbərlik etməsi bu işdə az rol oynamırdı. Hələ sovet dönəmində böyük islahatları və yenilikləri ilə hamını şoka salan, güclü savadı, kəskin məntiqi və natiqlik qabiliyyəti ilə seçilən, yüksək çinli məmurların bircə hərifinə toxunmağa cürət etmədiyi "SSRİ qanunları"nı bilərəkdən pozan, həmin

qanunları camaatın güzəranını yaxşılaşdırmağa yönəldən Salman Salahov sözün əsl mənasında mənəvi dayağımız idi.

"Laçın yurdu" jurnalının çapına qərar verəndə elə ilk xeyir-duanı da həmişə sözə tapınan, haqsızlığa qarşı çıxan dostumdan - Seyid Əlidən almaq istədim. Ancaq səhhətində yaranan problemlərə görə onu narahat etmədim və ailənin böyük oğlu Uğurludan xeyir-dua aldım. O, ailənin bütün üzvləri adından redaksiya heyətinə uğurlar dilədi.

Söhbət zamanı mən həm də Uğurlunun tarixi keçmişimizə qırılmaz tellərlə bağlılığının, mətbuata böyük sevgisinin şahidi oldum, yeni-yeni keyfiyyətlərini sanki təzədən kəşf etdim.

**Arif KAMRANOĞLU**

**İDMANÇILARIMIZ**




## RƏŞAD ABBASOV

Abbasov Rəşad Ələsgər oğlu 1979-cu il iyun ayının 25-də Laçın rayonunun Mişni kəndində anadan olub.

İdmana böyük həvəsi olan Rəşad 1992-ci ildə Qaradağ rayon Sahil qəsəbəsində karate məşqlərinə başlamış və 1993-cü ildən Süleyman Məmmədlinin rəhbərliyi altında Taekvando ilə məşğul olmağa başlamışdır.

2001-ci ildən Hapkido idman növü ilə məşğuldur. 1998-ci ildən məşqçi müəllim işləyir.

2007-ci ildə Almaniyanın Hamburq şəhərində keçirilən dünya çempionatının, ABŞ-ın Kaliforniya ştatının Sakramento şəhərində keçirilən Dünya Qızıl Kubokunun, 2008-ci ildə Fransada keçirilən Avropa çempionatının qalibidir.

Rəşad Abbasov həmçinin Almaniyada keçirilən Avropa kubokunun bürünc mükafatçısıdır.

Yetirmələrindən Tağızadə Cahid dünya çempionudur. Məmmədov Fuad Avropa kubokunun gümüş mükafatçısı, Şükürov Elvin və Xəlilov Sahil dünya çempionatının bürünc mükafatçılarıdır.

Rəşad Abbasov ailəlidir, iki övladı var.

## ŞƏRƏFLİ ÖMÜR YOLU



Biz tərəflərin insanlarında ifrat dərəcədə təvazökarlıq var. Əlinə qələm götürüb kiminsə barəsində yazmaq istəsən o saat etirazla qarşılaşırsan.

Amma özünün etirazına baxmayaraq biz polis polkovnik-leytenantı Hüseynalı Hüseynov haqqında yazmaqda qətiyyətli idik. Çünki gənc yaşlarından cinayətkarlıqla mübarizə aparan, Qarabağ döyüşlərində oğlu Zülfəli ilə birlikdə həmişə ön cəbhədə vuruşan polis zabitindən söhbət açmamaq qəbahət olardı.

Məlumat üçün bildirək ki, Hüseynalı Hüseynov 1941-ci ildə Laçın rayonunun Şəlvə kəndində o bölgənin sayılıb-seçilən kişilərindən olan Qələndər Həsənovun ailəsində doğulub. Aydınlıq gətirək ki, elə Hüseynalının da əsl soyadı Həsənovdur. Doğum şəhadətnaməsi yazılarkən texniki yanlışlığa yol verilib. Sonralar bu səhvi düzəltmək yada düşməsə də, daşıdığı soyadla əsl soy-kökünə xələl gətirməyib. 7 illik təhsilini kənddə alıb. Orta təhsilini Laçın şəhər 1 №-li məktəbində tamamlayıb. 1962-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) iqtisad fakültəsinə daxil olub. 1967-ci ildə ali təhsilini başa vuran Hüseynalı Hüseynov 1968-ci ildə Laçın Rayon Daxili İşlər Şöbəsində işə başlayıb. Onun polis orqanlarına gəlişinin səbəbi əmisi Atakişi Həsənovun yolunu davam etdirmək istəyi ilə bağlıydı. 1930-cu ildə xidməti vəzifəsini yerinə yetirərkən qətlə yetirilmiş əmisinin şəklini Daxili İşlər Nazirliyinin şərəf lövhəsində görməsi qəlbini qürur hissi ilə doldurmuşdu və bu çətin, eyni zamanda şərəfli peşənin cazibəsindən ayrıla bilməmişdi.

1969-cu ildə Şəlvə zonasına sahə inspektoru təyin olunur. İşinin öhdəsindən bacarıqla gəldiyinə görə 1973-cü ildə onu cinayət hadisələrinin daha çox baş verdiyi Şamkənd zonasına dəyişirlər. 1983-1985-ci illərdə Minkənd zonasında sahə inspektoru işləyən Hüseynalı Hüseynov 1986-cı ildən Cinayət Axtarış Şöbəsində baş inspektor, bir qədər sonra isə bölmə rəisi vəzifəsinə irəli çəkilir.

İnsanlarla səmimi ünsiyyət qurması, onlara etibar etməsi neçə-neçə cinayət hadisəsinin açılmasına səbəb olmuşdur. 22 iyul 1982-ci ildə rayonun ərazisində yerləşən Qaranlıq yaylağında, Dar dərə adlanan yerdə

vəhşicəsinə qətlə yetirilmiş, sonra isə üstü daşla örtülmüş bir qadın meyiti tapılmışdır. Təxirəsalınmaz tədbirlər nəticəsində üç gün müddətində qadının şəxsiyyəti, onu qətlə yetirən cinayətkar müəyyənləşdirilmişdir. Bu qatı cinayətin açılmasında Hüseynalı Hüseynovun xüsusi xidməti danılmazdır. Onlarla belə faktı sadalamaq mümkündür.

Bəzən gözlənilməz hadisələr insanın fəaliyyət sahələrinə təsirsiz ötüşmür. Bir vaxtlar aramızdakı tüfeylilərlə, oğrularla mübarizə aparan Hüseynalı Hüseynov 1988-ci ildən yer üzünün ən vəhşi canilərinə, insan qanına susayan erməni qəsbkarlarına qarşı vuruşub. İgid polis həmkarları ilə çiyin-çiyinə döyüş meydanına atılaraq düşmənə ağır zərbələr endirib. Fərəcan, Səfian, Qazıdərəsi, Hoçaz, Güləbird, Haqnəzər, Pircahan döyüşlərində göstərdiyi şücaətə görə camaatın məhəbbətini qazanıb. Daxili İşlər Nazirliyi tərəfindən dəfələrlə mükafatlandırılıb.

Atəşkəsdən sonra istefaya çıxan Hüseynalı Hüseynov Vətən qarşısında övladlıq borcunu şərəflə yerinə yetirsə də, işğal altında qalan torpaqlarımız yağı tapdağından azad edilənə qədər rahatlıq tapmayacağını deyir. Qarış-qarış gəzdiyi, hər daşı, qayası uğrunda vuruşduğu doğma dağlara qayıtmaq ümidini də itirməyib. Bizə isə hələlik "ümidiniz tükənməsin, arzunuz çin olsun" demək qalır.

**Arif MƏMMƏDLİ**

## ATA HÜSEYNALI,
## OĞUL ZÜLFƏLİ

Gəlir igidlərin səsi dağlardan:
"Qisas almalıyıq biz daşnaklardan!"
Zəfərlə çıxacaq sərt sınaqlardan
Ata Hüseynalı, oğul Zülfəli.

Həsrət zirvənin də qəddini əyir,
O çox da ucadır, buluda dəyir.
"Laçınsız yaşaya bilmərik" deyir
Ata Hüseynalı, oğul Zülfəli.

Biri aslanlaşıb, biri şirləşib,
Çünki ürəklərdə Vətən yerləşib.
Döyüşə-döyüşə cəngavərləşib
Ata Hüseynalı, oğul Zülfəli.

Ay dost, qüdrətimiz get-gedə artır,
Torpağı gör necə sevənlər vardır.
Bir kökdən güc alan qoşa çinardır
Ata Hüseynalı, oğul Zülfəli!

**Oqtay RZA**

**SƏNƏTÇİLƏRİMİZ**

## "ƏVVƏLDƏN LAÇIN DEMİŞƏM, AXIRA QƏDƏR DƏ LAÇIN DEYƏCƏM"



*Müsahibimiz Azərbaycanın tanınmış müğənnisi, təəssübkeş eloğlumuz Məhəbbət Kazımovdur.*

***- Məhəbbət müəllim, Sizi Azərbaycanda hamı tanıyır. Amma bir anlığa təsəvvür edək ki, yad bir ölkədəsiniz, özünüzü tanıtmağa ehtiyac var. Nədən başlardınız?***

- Öncə doğma ölkəmdən başlayardım. 1956-cı ildə Laçın rayonunun Çorman kəndində dünyaya göz açdığımı, doğulduğum məkanın mənim üçün çox əziz olduğunu deyərdim. Bu, doğrudan da belədir. Mənim aləmimdə bütün dünyanın mərkəzi Laçındır, doğulduğum kənddir.

***- Uşaqlıq illərini, gənclik dövrünüzü necə xatırlayırsınız?***

- Uşaqlığım da elə dağda, bağda, çayların üstündə, dərələrdə, ovda keçib. Kənddə həmişə növbə ilə naxıra gedərdilər. Tay-tuşlarımla "nobat"a getdiyim günləri unuda bilmirəm.

Orta məktəbi Şamkənddə oxumuşam. Kəndimizlə məktəb arasındakı məsafə 11 km idi. Məktəbə piyada gedib-gələrdik. Məndən uzaqlarda qalan uşaqlığım indi xatirələrə çevrilib. Acılı-şirinli gəncliyimi də tez-tez xatırlayıram.

***- Sənətə gəlişinizdə kimlərin rolu olub?***

- Allahın verdiyi səs məni 1974-cü ildə Bakıya gətirib. Sənətə gəlişimdə Bakıda yaşayan böyük qardaşım Əhliyyətin də rolu olub. Onun köməyi ilə musiqi təhsili almaq imkanı qazanmışam. Böyük xanəndəmiz, Seyid Şuşinskinin tələbəsi olmuş Nəriman Əliyevin sinfində muğamın sirlərinə yiyələnmişəm. Necə deyərlər, yol-yolağanı o öyrədib. Sonralar isə Ağaxan Abdullayev mənə dərs deyib. Belə başlamışam sənətə.

***- Xəyalınızda iki Məhəbbət canlandırdığınız an olurmu? Heç haminin tanıdığı Məhəbbət təkcə doğmalarının, dostlarının və qonşularının tanıdığı Məhəbbət üçün darıxırmı?***

- Çox gözəl sual verdiniz. Bilirsiz necədi? İnsan çox vaxt, bəlkə də hər vaxt özü olmaq istəyir, amma sənətimiz də elə sənətdir ki, həmişə özümüz olmağı bacarmırıq. O Məhəbbət üçün elə darıxmışam, elə darıxmışam (kövrəlir)... Kaş həmin Məhəbbət olaydım. Doğulduğum yerdə,

çayın qırağında sonsuz məhəbbətlə sevdiyim təbiətin seyrinə dalaydım. Sizin tanıdığınız Məhəbbət özüm qədər heç kəsin tanımadığı o Məhəbbət üçün yaman darıxıb.

***- Laçından ilk məşhurlaşan xanəndə, müğənni sizsiniz. Ancaq indi sənətə istedadlı gənclər gəlir. Kimlərin adlarını çəkərdiniz?***



- Çox oxuyanlar var Laçınımızdan. Tanınmış xalq artistləri Mənsum İbrahimov, Aygün Bayramova əslən laçınlıdırlar. Qarabağda yaşayıblar deyə, onları xalq Qarabağ xanəndələri kimi tanıyır. Əslində Laçını Qarabağdan ayırmaq da mümkün deyil.

Bütün şairlər, yazarlar, aşıqlar içində təkcə Sarı Aşığın adını çəksək bəs edər. O bizim mənəvi coğrafiyamız, xəritəmizdir.

İstedadlı gənclərdən söhbət düşəndə Ehtiramın adını xüsusi çəkərdim. Çox gözəl sənətkardır, həm də mənliyi, dəyanəti, kişiliyi, ədəb-ərkanı ilə seçilən eloğlumuzdur.

***- "Laçınım" mahnısı Sizə böyük şöhrət gətirməklə bərabər, laçınlı olmadığınızı söylədiyinizə dair xoşagəlməz söhbətə də son qoydu. Yeri gəlmişkən, bu mahnının sözlərinin kimə məxsusluğu da mübahisəlidir.***

- Deyim də, burda nə var ki? Musiqisi mənim, sözləri Osman Alıyevindir. Mərd bir kişidir. Bir sistem işçisi var idi (Məhəbbət müəllim onun adını da dedi, yazmağı məsləhət bilmədik). Şeirlər yazıb gətirirdi. Görürdüm ki, şeirin dalı-qabağı yoxdur. Deyirdim axı bu şeir deyil, necə oxuyum bunu. Heç olmasa, vətənpərvərlik mövzusunda bir şeir gətir. O

da "Laçınım" mahnısının sözlərini gətirdi. Nəqarəti belə idi: "Qoy quş olub göylərində uçum mən". Dedim quş nədir, dağa qartal yaraşar. Beləcə "Qartal olub göylərində uçum mən" variantının üzərində dayandıq.

Tez-tez yığışdığımız məkana bir gün əsl kənd adamı olduğu hiss edilən sadə görkəmli bir nəfər gəldi. Dedi ki, sənə təşəkkür etməyə gəlmişəm. Tanımadım, soruşdum ki, axı sən kimsən? Kitabı çıxardıb qoydu ortaya, tanışlıq verdi: adım Osmandır, "Laçınım" şeirini mən yazmışam. Həqiqət üzə çıxdı, inandım. Sonra onları üzləşdirdim. Özgənin şeirini mənimsəyən adama dedim ki, get öz işinlə məşğul ol, sən oğruymusan, özü də söz oğrusu.

Məhəbbət müəllim elə "Laçın!" deyə-deyə öləcək. Əvvəldən Laçın demişəm, axıra qədər də Laçın deyəcəm. O dedi-qodunu yayanlar böyük səhvə yol veriblər. Vaxtında mən "Laçınım!" deyib hayqıranda bəzilərinin mısmırığı yerlə gedirdi. İndi Laçınım demək olur. Laçınlılar vardı ki, müəyyən məsələlərdə laçınlı olduqlarını danırdılar.

***- Xarici ölkələrdə olanda hansı hisslər keçirirsiniz?***

- Xarici ölkələrə səfərlərim elə də çox deyil. Türkiyədə, İranda, Rusiyada və Çexoslavakiyada olmuşam. Daha çox Türkiyədə olmaq arzusunda idim. İranda da oldum, mənə yaxşı təsir bağışlamadı. Siyasətlə məşğul olan adam deyiləm, amma azərbaycanlılar İranda kölə halında yaşayırlar. Türkiyədə isə çox yerləri gəzdim. Sultan bəyin qəbrini ziyarət elədim. Qardaş ölkəyə hər səfərim məndə xoş təəssüratlar yaradır.

***- Bəzən Sizi tənbəllikdə günahlandırırlar. Görünür, pərəstişkarlarınızın Sizdən daha çox şey umduğu üçün belə fikir formalaşıb.***

- Tənbəlliklə müəyyən məqamları qarışdırmaq olmaz. Ruhlandırmaq tamam başqa bir şeydir. O vaxt adam tənbəl olur ki, onun əməyini qiymətləndirməyəsən, ruhlandırmayasan. Bu, tənbəllik deyil. Həmişə çalışırlar ki, məni ruhdan salsınlar, ona görə də camaata tənbəl kimi görsənirəm. 30 ildə saysız-hesabsız mahnılar oxumuşam. Böyük əksəriyyətinin musiqisi özümə məxsusdur. Bəstəkarlığın gözü-qaşı olmur ki. Təvazökarlıqdan uzaq olmasın, təkcə "Laçınım" mahnısı nəyə desən dəyər. Xalqın adamı olmaq, xalqın hörmətini qazanmaq çox çətindir. Amma gərək xalq da öz sözünü desin. Xalqın üzdə olan, sözü keçən insanlarını, alimlərini nəzərdə tuturam. Adamın əməyi qiymətləndirilməyəndə ruhdan düşər də. Özüm haqqında nə isə danışmağı şəxsiyyətimə də, sənətimə də yaraşdırmaram. Söhbət addan getmir. Min cür haqq-hesab, qısqanclıq var. Məsələn, bu yaxınlarda Laçın haqqında bir film göstərirdilər. Orada Məhəbbətin "Laçınım" mahnısından bir hissə vermək olmazdımı? Belə

şeyləri başa düşüb, verirsən qulaq ardına, onda da deyirlər ki, tənbəlsən. Mən bildiyimi, nöyzanbillah, Allahdan savayı heç kim bilmir.

***- Batabat səfərinizdəki videogörüntülər daha çox kövrək notlarla yadda qalıb...***

- Bizi dostları ilə birlikdə Naxçıvana, Batabata böyük şəxsiyyət, hörmətli generalımız Qaçay Quliyev aparmışdı. Ziyafət təşkil edilmişdi. Camaat eyş-işrətdə idi. Mən də bir alça ağacının altında oturub fikirləşirdim. Dedilər buradan Laçına hava yolu ilə 80 km-lik yoldur. Batabatın yaylağı elə bil  bizim yaylaqların bir parçasıydı. Hər tərəf gül-çiçək... Amma görünən doğma dağlara əlim çatmırdı. İçimi bürüyən kədərlə baş-başa qalmışdım. Bu məqamda Hüseyn Kürdoğlunun oğlu İlham Alışanov məni sanki yuxudan oyatdı: danış, nə fikirləşirsən? Dedim evini Allah tiksin, danışmaq olur ki?! Qəhərləndim.

***- El şənliklərində, ayrı-ayrı görüşlərdə olanda yəqin ki, maraqlı hadisələrlə qarşılaşırsınız. Belə hadisələrdən birini də Yaşar Nuri danışmışdı.***

- Hə, Yaşar müəllimlə eyni məclisdə idik. Allah işlərinə rəvac versin, sağlamlığı bərpa olsun. O da ağ geyinmişdi, mən də. Hava isti olduğu üçün pencəyi çıxartmışdıq. Burdan başqa bir tədbirə getməliydim. Pencəyi geyinib çıxdım. Təzəcə aralaşmışdım ki, Yaşar müəllim məni çağırdı. Dedi ki, istəyirəm sənə pul verəm. Dedim nə pul, Yaşar müəllim, səndə pul hardandır? Dedi yox e, sənə xeyli pul verəcəm. Dedim etmə, eləmə, nə pul, ay kişi? Əlini cibinə salıb bir qom pul çıxartdı. Sən demə, Yaşar müəllimin pencəyini geyinmişəm. Mənim cibi pulla dolu olan pencəyim isə orada qalıb.

Bir dəfə də Sabirabadın Yolçubəyli kəndində toy aparırdım. Əvvəllər bütün el şənliklərində muğam dəsgahı sifariş verərdilər. "Rast" muğamını oxuyurdum, "Vilayəti" hissəsində işıq söndü. Bazburutlu bir kolxoz sədri (adını unutmuşam) 100 rubl atıb:- hə, indi oxu e,-dedi. Dedim ki, bu səs məndədirsə oxuyaram. Oxudum. 100 rubl da atıb "Qarabağ şikəstəsi" oxumağımı istədi. Dedim biz "Rast"ı danışmışdıq, "Qarabağ şikəstəsi"nin qiyməti ayrıdır. Dedi nə qədərdir? Dedim 500 rubl. Razılaşdı: - Amma oxuya bilməsən alacam ha. Dedim al də. Çıxardıb 200 rubl da verdi. Oxuyub qurtarandan sonra qarşımda dayanıb dedi - a qara gədə, anamı ağlatdın e!

***- Ənənəvi bir sual da verək. Övladlarınızın sənətinizi davam etdirməsini istərdinizmi?***

- Əgər sənət varsa, onun qarşısını almaq qeyri-mümkündür. Yoxsa elə-belə tutum qolundan ki, gəl sənətimi davam elətdir. Ömrümdə buna

razı olan adam deyiləm. Artıq balalarım böyüyüblər, universitet tələbələridir. Öz seçimlərini də ediblər.

Bir də o qədər yollar keçmişik ki... Hərdən əzablı yollar, hərdən gözəl yollar... Əzabı-əziyyəti daha çox olan bu yolu övladlarımın davam etdirməsini istəmərəm.

***- Sonda laçınlılara, ilk addımlarını atan "Laçın yurdu" jurnalına arzularınızı, ürək sözlərinizi eşitmək bizdən ötrü xoş olardı.***

- Arzu sonsuzdur, tükənməzdir. Heç kim deyə bilməz ki, mən yüz faiz arzuma çatmışam. Amma bütün arzulardan ucada duran müqəddəs bir arzum qalıb, Laçına qayıtmaq arzusu. İnşallah, ömür vəfa etsə özümə, etməsə balalarıma Laçını görmək qismət olar.

Heç kəsin xətrinə dəyməsin. Mənə görə, yer üzərində Laçına bənzər yer yoxdur. 1974-cü ildən Bakıda yaşayıram. Laçınlıların heç vaxt əyildiyini görməmişəm. Laçın adını indiyə qədər nə cür yaşadıblarsa, bundan sonra da yaşatsınlar. Övladlarına, balalarına aşılasınlar ki, belə bir məkanları var. Biz dağ adamıyıq, dağ vüqarlı insanlarıq. Heç vaxt əyilməyək, əzilməyək. Sizə Laçın dağı qədər əzəmətli ömür arzulayıram.

"Laçın yurdu"nun əməkdaşlarına da uğur diləyirəm. Mən əli, ayağı yüngül adamam. Allahdan arzum budur ki, bu jurnal Laçında işıq üzü görsün. Orada görüşə bilək. Böyük arzularla deyirəm ki, Allah sözünüzü məntiqli, mənalı eləsin. Amma bir qələminiz, bir üzünüz olsun. Mətbuat böyük qüvvədir. Onu bəzi əqidəsiz adamlar ucuzlaşdırırlar. Tövsiyəm odur ki, öz işinizi görəsiniz. Düzü düz, əyrini əyri yazasınız.

***-Müsahibə üçün sağ olun.***

Söhbətləşdilər:
**Arif MƏMMƏDLİ,**
**Siyavuş ƏMİRLİ**
**və Rəşad ABASLI**
Fotolar:
**Çingiz ALIOĞLUNUNDUR**



## ŞAHMALI KÜRDOĞLUNUN SEVİMLİ TƏLƏBƏSİ

Qaybalı Mədət oğlu Məhərrəmov 1964-cü ildə Laçın rayonunun Hacıxanlı kəndində zəhmətkeş kəndli ailəsində dünyaya göz açıb. Kiçik yaşlarından musiqiyə böyük həvəsi olan Qaybalı Məhərrəmov el şənliklərində oxumağa başlayır. Çox keçmir ki, Laçın rayonunda tanınır və ecazkar səsi, gözəl zənguləsi ilə dinləyənlərin rəğbətini qazanır. O zamanlar ailənin imkansızlığına görə musiqi təhsili ala bilmir və hərbi xidmətə yollanır. Hərbi xidmətini başa vurduqdan sonra milli musiqimizin beşiyi sayılan Ağdama qayıdır. 1988-ci ildə məşhur xanəndə Şahmalı Kürdoğlunun da dərs dediyi Ağdam Musiqi Məktəbinin muğam şöbəsinə qəbul olunur, görkəmli sənətkar Şahmalı Kürdoğludan muğamın sirlərini öyrənir.

Təhsil aldığı müddətdə “Xarı bülbül” müsabiqəsi keçirilir. Bu festivalda iştirak edən gənc xanəndənin bənzərsiz ifası tamaşaçılar tərəfindən böyük maraqla qarşılanır. Tez-tez el şənliklərinə və dövlət tədbirlərinə dəvət alan Qaybalının bulaq suyu kimi saf, dumduru təbii səsi daha da cilalanır.

Şahmalı Kürdoğlunun ən sevimli tələbələrindən biri olan Qaybalı Məhərrəmov 1992-ci ildə məktəbi bitirir. Qarabağ müharibəsinin başlaması onu həvəsdən salır, fəaliyyətində müəyyən fasilələr yaranır.

Hal-hazırda pedaqoji fəaliyyətlə məşğuldur. Ağcabədi şəhərində yerləşən Laçın rayon musiqi məktəbində dərs deyir. Həmişə reklamdan uzaq qaçmasına, ekranlarda az-az görünməsinə baxmayaraq Qarabağ bölgəsində sayılıb-seçilən el xanəndəsidir.

**Müşfiq MƏHƏRRƏMOV**

## EHTİRAM HÜSEYNOV



1980-ci il oktyabr ayının 18-də Laçın rayonunun Hacısamlı kəndində anadan olmuşdur. 1987-ci ildən Hacısamlı kənd 8 illik məktəbində təhsil alıb. 1992-ci ildə Laçın rayonunun erməni işğalçıları tərəfindən işğal olunması səbəbilə təhsilini Bakı şəhəri, Binəqədi rayonundakı 284 saylı orta məktəbdə davam etdirmişdir. Uşaqlıq illərində Ağdam Muğam Məktəbində musiqi təhsili alıb. 1994-1995-ci illərdə Azərbaycan Respublikası Dövlət Televiziya və Radio Verilişləri Şirkətinin "Bənövşə uşaq xoru"nda musiqi fəaliyyəti göstərib. 1997-ci ildə Asəf Zeynallı adına musiqi kollecinə daxil olub və bu kolleci uğurla bitirib. Görkəmli muğam ustası Canəli Əkbərovdan dərs alıb. 2007-ci ildə Azərbaycan Mədəniyyətinin Dostları Fondunun layihəsi əsasında Heydər Əliyev Fondunun dəstəyi, Azərbaycan Mədəniyyət və Turizm Nazirliyinin köməyi ilə həyata keçirilən Azərbaycan Televiziyasının "Muğam" televiziya müsabiqəsində iştirak etmiş, 2-ci yerə layiq görülmüşdür. 2008-ci ildə Azərbaycan Milli Konservatoriyasına daxil olub. Xalq artisti Arif Babayevin tələbəsidir. Çoxlu sayda beynəlxalq qastrollarda və müsabiqələrdə iştirak edib. 2011-ci ildə Bakıda keçirilən Beynəlxalq Muğam festivalının qalibi olub.

Hal-hazırda "Muğam teatrı"nın solistidir.

## HABİL ƏZİMOV (Habil Laçınlı)



Gənc xanəndə Habil Əzimov Asəf Zeynallı adına Musiqi Texnikumunun məzunudur. Azərbaycanın görkəmli muğam ustası Ağaxan Abdullayevdən dərs alıb. Ağcəbədi rayonunun Hacıbədəlli uşaq musiqi məktəbində müəllim işləyib.

2008-ci ildən Laçın rayon Şamkənd kənd uşaq musiqi məktəbində muğamdan dərs deyir. Ağcəbədi rayonundakı “Alman” qəsəbəsində məskunlaşan Habil həm də el şənliklərinə ən çox dəvət alan müğənnilərdəndir. Xüsusilə, o bölgədə yeni ailə quran laçınlıların toy məclisləri Habilsiz keçmir.



## BALACA TARZƏN

Ata-baba yurdu Laçın rayonunun İmanlar kəndi olan Bəxtiyarın qismətinə 1998-ci ildə Sumqayıtda doğulmaq düşüb. Atası Şiralının halal çörəyini yeyib. El-obamızın tanınmış ziyalısı, həmişə haqqa-ədalətə söykənən, itirilmiş torpaqların ağrısını kövrək ürəyində daşıyan Əli Bəndəliyevin nəvəsidir.

2004-cü ildə Sumqayıt şəhərinin Sarıqaya yaşayış massivində yerləşən, əvvəlinə "köçkün" sözü artırılan Laçın rayon 21 saylı tam orta məktəbin I sinfinə gedib. Eyni zamanda Laçın rayon Şəlvə musiqi məktəbində musiqi təhsili alıb, könlünü Sadıqcanın, Qurban Pirimovun göylərə qaldırdıqları xalqımızın klassik simli alətinə-tara bağlayıb. Müəllimi Ayaz İmranov (laçınlı Aşıq İmranın oğlu) sədəfli tarı ona elə sevdirib ki, ürəyinin başında gəzdirir, qucağından yerə qoymur. Xatırladaq ki, Ayaz İmranov bu gün respublikamızın sayılıb-seçilən bənzərsiz tar ifaçılarından biridir. Milli musiqimizin Azərbaycanın hüdudlarından kənarda təbliğ olunmasında böyük xidmətləri var.

Sevimli müəlliminin etimadını doğruldan Bəxtiyar xeyli uğurlara imza atıb. Rayonun mədəni-kütləvi tədbirlərində fəal iştirakına və musiqi təhsilində qazandığı yüksək nailiyyətlərə görə fəxri fərmanlarla təltif olunub. Ümummilli lider Heydər Əliyevin 85 illik yubileyinə həsr edilmiş I Respublika Müsabiqəsinin laureatıdır.

18 noyabr 2009-cu il tarixdə Ağcabədi rayonunun Taxtakörpü qəsəbəsində Laçın rayon uşaq musiqi məktəblərinin kollektivləri ilə görüş zamanı Bəxtiyarın ifasını bəyənən Azərbaycan Respublikasının Xalq artisti, Milli Konservatoriyanın rektoru, professor Siyavuş Kərimlinin tövsiyəsi və şəxsi dəstəyi ilə balaca tarzən indi musiqi təhsilini konservatoriyanın nəzdindəki İncəsənət Gimnaziyasında davam etdirir. Laçın rayon rəhbərliyi və sabiq millət vəkili Sevindik Hətəmov məktəbi bitirənədək onun təhsil xərclərini öz üzərlərinə götürüblər. Burada da özünəməxsus ifaları ilə yadda qalan Bəxtiyar Bəndəliyev uşaq musiqi və incəsənət məktəbləri şagirdlərinin xalq çalğı alətləri üzrə respublika müsabiqəsində, "Mysterious World of Young Talents" festivalında uğurlu çıxışlarına görə fəxri diplomlara, tərifnamələrə layiq görülüb.

Ümidvarıq ki, Bəxtiyarı qarşıda daha böyük müvəffəqiyyətlər gözləyir. Ona da əminik ki, o, ən gözəl ifasını torpaqlarımızın işğaldan azad olduğu gün doğma Laçınımızda səsləndirəcək. Həmin günü elə biz də səbirsizliklə gözləyirik.

**Cəlal ARİFOĞLU**

## MURAD LAÇINLI



Məmmədov Murad Baxşeyiş oğlu 1966-cı ildə Laçın rayonunun Şəlvə kəndində anadan olub. 1982-ci ildə Şəlvə kənd orta məktəbini bitirib və Gəncə şəhərində İnşaat Texnikumuna daxil olub. Oranı bitirdikdən sonra Rusiyada hərbi xidmət keçib. Uşaq yaşlarından musiqiyə, xüsusilə xanəndəliyə böyük maraq göstərib. Hələ Sovetlər Birliyi dönəmində Ukrayna Respublikasının Donetsk şəhərində keçirilən musiqi müsabiqəsinin qalibi olub.

Sonrakı illərdə Şuşa musiqi texnikumunu bitirib. Dövlət tədbirlərində müntəzəm çıxış edən Murad Laçınlı hal-hazırda Qaradağ rayon Mədəniyyət sarayında fəaliyyət göstərən "Laçın" instrumental ansamblının bədii rəhbəridir.

## TƏBRİK

### "Laçın yurdu"nu Laçında görüm



"Laçın yurdu" adlı jurnalın ilk sayının çap olunacağını eşidəndə düzü çox sevindim. Laçın Vətənimizin dilbər guşələrindən biridir. İlk öncə 80-ci illərdə yazdığım "Laçında gördüm" adlı şeir yadıma düşdü. Elə həmin şeirlə də jurnalın kollektivini təbrik edir və onlara yeni-yeni yaradıcılıq uğurları arzulayıram. Arzu edirəm ki, "Laçın yurdu" jurnalının Laçında çap olunduğunu görüm.

Vətən torpağını gəzdim, dolandım,
Ən ülvi isməti Laçında gördüm.
Dostlar ürəyinin saf duyğusunu,
Səmimi ülfəti Laçında gördüm.

Müqəddəs varlıqdı bu eldə qonaq,
Çıxdı görüşümə Şəlvə, Dambulaq.
Çalbayır halımdan çox tutdu soraq,
Tükənməz hörməti Laçında gördüm.

Zəmanə nə gözəl veribdi təkan,
Cənnətə, behiştə dönüb bu məkan.
Zirvələr yurd olub, qayalar məkan,
Gül açan zəhməti Laçında gördüm.

Babalar ah çəkdi, ağadan dedi,
Nənələr boylandı ağa dan dedi,
Cavanlar dilləndi Ağadan[1] dedi,
Şeiri, sənəti Laçında gördüm.

Şiruyə, ömründən ötüşən bu an,
Ölüncə yadından silinməz inan.
Düşmənə qəzəbli, dosta mehriban,
Ən zərif xisləti Laçında gördüm.

**SƏRRAF Şiruyə,**
***AYB və AJB-nin üzvü.***

---

[1] Şair Ağa Laçınlı nəzərdə tutulur.

## FƏAL İCTİMAİYYƏTÇİ, TƏŞƏBBÜSKAR MÜƏLLİM

Məmmədov İbrahim Məmməd oğlu 1950-ci ildə Laçın rayonunun Şəlvə kəndində anadan olub. Orta təhsilini doğma kəndində alıb. 1966-cı ildə Şuşa Kənd Təsərrüfatı Texnikumuna daxil olmuş, bir neçə aydan sonra Şuşa Pedaqoji Məktəbinə köçürülmüşdür. 1970-ci ildə texnikumu bitirir və təyinatla Şəlvə kənd orta məktəbinə müəllim göndərilir. Həmin ildən məktəb komsomol təşkilatının katibi seçilir. Səmərəli fəaliyyətinə görə respublika, ümumittifaq səviyyəli Fəxri Fərmanlara layiq görülür. Fəal ictimaiyyətçi kimi kəndin abadlaşmasına da böyük köməyi dəyir.



Bioqrafiyasından danışanda xüsusi məqamlara aydınlıq gətirməyi vacib sayır:

- Atam Məmmədov Əliqulu Zülfüqar oğlu 25 il kənd sovetinin katibi işləmişdir. Anamın qardaşı olmadığı üçün ana babam məni körpə vaxtı övladlığa götürüb. Ona görə də sənəddə babamın nəvəsi yox, oğlu kimi yazılıram.

Ana babam Tağıyev Seyid Məmməd ağa el ağsaqqalı olub. Özünün dediyinə görə, o vaxt doqquz qan düşmənçiliyini barışdırıb. On bir nəfərin müxtəlif vaxtlarda ölümlə nəticələnmiş qan davasını o kişiyə keçiblər. Seyid Məmməd Ağa ağır seyid olmaqla bərabər, həm də çox hazırcavab və müdrik bir kişi olub. Yaxşı yadımdadır, istər böyük, istər kiçik, kişilər də, qadınlar da görüşəndə ona ehtiram göstərər, əlindən öpərdilər.

Ata babam Məmmədov Zülfüqar Şahverdi oğlu II Dünya Müharibəsində qəhrəmancasına həlak olub. 1985-ci ildə - Böyük Qələbənin 40

illiyi ərəfəsində dünyaya gələn oğluma atam Zülfüqar babamın adını verdi. Ana babam 1937-ci ildə repressiya qurbanı olub. Ona ölümündən sonra bəraət verilib.

1992-ci ilin mayında Qaradağ rayonunun Lökbatan qəsəbəsində məskunlaşıb. 1994-cü ildən isə Laçın rayon İcra Hakimiyyətinin Qaradağ rayonu üzrə səlahiyyətli nümayəndəsidir. Burada məskunlaşan bütün ailələrin dərd-sərini özününkü hesab edir, imkanı daxilində onların problemlərini həll etməyə çalışır.

İbrahim müəllim həm də nümunəvi ailə başçısıdır. Böyük oğlu Vüqar ixtisasca hüquqşünasdır. Azər və Zülfüqar da ali təhsil alıblar, qızı Samirə Bakı Dövlət Universitetinin məzunudur. Ən əsası odur ki, övladlarına yüksək vətənpərvərlik hisslərini aşılayıb, doğma Laçını, Şəlvə dərəsini onlara canı-dildən sevdirməyi bacarıb.

İbrahim Məmmədovun mətbuata bağlı bir insan olduğunu xüsusi vurğulamalıyıq. O, 1970-ci ildən "Laçın" qəzeti ilə əməkdaşlıq edərək publisistik və satirik yazılarını, felyeton və təmsillərini, miniatürlərini çap etdirib. İndi əvvəlki həvəslə yazıb-yaratmasa da, yaradıcılıqdan tam uzaqlaşdığına da inanmırıq. Yəqin ki, şəxsi arxivində hələ işıq üzü görməmiş yazılar var. Elə bu inamla da onun bir neçə miniatürünü "Laçın yurdu" jurnalına təqdim etməyi özümüzə borc bilirik.

***

Bir nəfərə dedilər:
-Az iç, bayıra çıxan kimi səni milis tutacaq.
-Görəsən milis özü ayıqdırmı?

***

-Dost, saçını niyə bu qədər uzatmısan?
-İstəyirəm mənə Məcnun desinlər.
-Məcnun yox, yəqin ki, Leyli deyərlər.

***

Birindən soruşurlar:
-Bir müdirə iki müavin düşərmi?
-Yox.
-Nə üçün.
-Papka götürmək üstündə dalaşarlar.

***

Müəllim valideynə deyir:
-Uşağınızın papiros çəkməsinə qarşı bir tədbir görmüsünüzmü?
-Bəli, qəlyan çəkməyi məsləhət bilmişəm.

**Ramin MƏMMƏDOV**
***yazıçı, jurnalist***



## YUSİF MİRZƏ

1959-cu ildə Laçın rayonunda anadan olub.

Erkən yaşlarından rəsmlər çəkib. İlk rəsmlərindən biri "Pioner" jurnalında çap olunub.

1976-cı ildə Bakıda Pedaqoji institutun bədii-qrafika fakültəsinə daxil olub.

1980-ci ildə institutda "Laçın etüdləri" adlı ilk fərdi sərgisi açılıb.

1981-ci ildə institutu bitirərkən rəngkarlıqdan diplom işi müdafiə edib və "əla'' qiymətə layiq görülüb.

1981-1985-ci illər Laçın xalq teatrında rəssam işləyib. Bir çox tamaşaların tərtibatını verib.

1985-ci ildən Azərbaycanda və xarici ölkələrdə sərgilərdə uğurla iştirak edir. Azərbaycan Rəssamlar İttifaqının üzvüdür.

Rəngkarlıq, qrafika, heykəltəraşlıqla məşğul olur. Özünəməxsus yaradıcılıq yolu, qeyri-adi üslubu, ustalıq dəst-xətti ilə tanınır.

Əsərləri hər zaman böyük maraqla qarşılanır. Sənətdə varisliyə - ənənələrin qorunub saxlanmasıyla bərabər novatorluğa, yeniliyə xüsusi əhəmiyyət verir. Yaradıcılığında arxaikliklə müasirlik, sadəlik, lakonikliklə polifoniklik, intuitivliklə professionallıq, ustalıq üzvi bir vəhdət təşkil edir.

Ən qədim sənət nümunələri ilə bağlı apardığı eksperimentlər uğurla nəticələnmişdir. Qədim ənənələrə tamamilə yeni ruh, yeni keyfiyyət verməyə, onları çağdaş bir dillə danışdırmağa nail ola bilmişdir.

Azərbaycan ərazisində eramızdan əvvəl XIV-XIII minilliklərdə yaradılmış Qobustan qayaüstü rəsmləri ənənələrinin müasir sənətə gətirilməsi, dirçəldilməsi, inkişaf etdirilməsi, mükəmməl bir formada orijinal sənət üslubunun yaradılması Yusif Mirzənin ən böyük nailiyyətlərindəndir. Təsadüfi deyil ki, onu Qobustan yaddaşını oyadan rəssam adlandırırlar.

O özünün unikal üslubunu yaratmış və təsdiq etmiş sənətkardır. Yusif Mirzənin yaradıcılığını izləyənlərdən bir çoxu bu fikirdədir ki, dünyada bu qədər qədim, iyirmi-otuz minillik ənənələrə əsaslanaraq son dərəcə çağdaş yeni bir üslub yaratmış ikinci belə rəssam tapmaq qeyri mümkündür.

Təkcə Qobustan qayaüstü rəsmlərindən deyil, digər qədim sənət nümunələrindən də ilhamlanır, yaradıcılığında onlardan məharətlə istifadə edir. O öz fikrini, məqsədini belə açıqlayır: "Qədim ənənələr - Çağdaş yozum."

Uğurlu rəsmlər məqsədə çatdığından xəbər verir.

Ənənəvi materiallarla-pastel, tuş, akvarel, yağlı boya, kömür, sangina, sepiya və s., lakin bənzərsiz, analoqu olmayan texnikalar, metod, vasitələrlə yaratdığı əsərlər dərin psixoloji təsir gücünə, sehrli bir ovqat yaratmağa, fəlsəfi ümumiləşdirmə qabiliyyətinə malikdir.

Uğurlar, nailiyyətlərlə kifayətlənməyən rəssam öz üzərində daim çalışır.

2005-ci ildə pastel texnikasında özünün yeni metodunu kəşf etmiş, maraqlı silsilə rəsmlər işləmişdir.



*Aylı gecə söhbəti*

Sənətsevərləri, pərəstişkarlarını heyrətləndirməyi bacaran Yusif Mirzənin sənət yönünü, üslubunu müəyyənləşdirmək üçün müxtəlif fikirlər, mülahizələr irəli sürülür. Rəssam öz üslubunu Meditativ-assosiativ konseptual avanqard kimi düşünür. Fikrimizcə, bu adın özü də şərtidir, bu üslubun geniş əhatə dairəsi vardır.

Əsərləri Azərbaycan Rəssamlar İttifaqında, Bakı İncəsənət Mərkəzində, Azərbaycan Xarici İşlər, İqtisadi İnkişaf, Mədəniyyət və Turizm nazirliklərində, Norveçin, İngiltərənin, Yaponiyanın, Türkiyənin, Rumıniyanın, Polşanın, ABŞ-ın, İsrailin, Fransanın Bakıdakı səfirliklərində, BP, STATOİL və digər neft şirkətlərinin ofislərində, otellərdə, banklarda, muzeylərdə və qalereyalarda saxlanılır.

"Qədim Bakının bəyaz yuxusu" adlı yağlı boya rəsmi Türkiyə Respublikası Prezidentinin müşaviri Hüseyn Avni Karslıoğlunun şəxsi kolleksiyasındadır.

ABŞ, İngiltərə, İrlandiya, Uels, Şotlandiya, Almaniya, Fransa, İsveçrə, İtaliya, Norveç, İsveç, Finlandiya, Danimarka, Hollandiya, Kipr, İran, Türkiyə, Litva, İsrail, Avstraliya, Rumıniya, Serbiya, Hindistan, Yeni Zellandiya, İspaniya, Kolumbiya, Sinqapur, Malaziya, Kanada, Rusiya və s. ölkələrdə əsərləri şəxsi kolleksiyalardadır.

Rəsmləri kataloqlarda, kitab və jurnallarda, təbrik kartlarında, təqvimlərdə çap edilmişdir.

2000-ci ildə “Aztelefilm” yaradıcılıq birliyi rəssam haqqında “İşıq” televiziya filmini çəkmişdir. Film Azərbaycan televiziyası ilə nümayiş etdirilir və maraqla qarşılanır.

Azərbaycanda və xarici ölkələrdə fərdi sərgiləri açılmış, yaradıcılıq səfərlərində olmuşdur. 2001-ci ildə dahi rumın heykəltəraşı Konstantin Brınkuşun yaradıcılığını sevən və təbliğ edən bir rəssam kimi onun doğma yeri Qorj vilayətinə, Tırqu-Jiu şəhərinə dəvət almış, orada fərdi sərgisi açılmış, naturadan rəsmlər çəkmişdir. Azərbaycanla Rumıniya mədəni əlaqələrinin inkişafında fəallığına görə xüsusi mükafata layiq görülmüşdür.

Norveçlə sıx əlaqələri vardır. Norveç Humanitar Müəssisəsi ilə qarşılıqlı əməkdaşlığı nəticəsində bu ölkədə tanınmış və populyarlıq qazanmışdır. NHM ilə birlikdə bir çox maraqlı layihələr həyata keçirmişdir.

“Muğam” rəsmi əsasında maykalar hazırlanmış, müxtəlif vaxtlarda təqvimlər, təbrik kartları nəfis şəkildə çap edilmişdir. Norveçin məşhur SKRUK xoru ilə Azərbaycan musiqiçilərinin birgə işi olan kompakt diskin bədii tərtibatında iştirak etmişdir. Həmin kompakt diskə əlavə edilmiş Azərbaycan xalq mahnı mətnlərindən ibarət kitabçanın üz qabığını rəssamın “Xatirə” rəsminin reproduksiyası bəzəyir.

1999-2000-ci illərdə Azərbaycanda səfərdə olan dünya şöhrətli böyük Norveç alimi, səyyahı, tədqiqatçısı Tur Heyerdalla görüşmüş, ona öz rəsmlərini göstərmişdir. Rəssamın qədim sənət ənənələrindən bəhrələnməsini Tur Heyerdal təqdir etmişdir.

Böyük alimə bəslədiyi hörmət hissinin ifadəsi kimi 2002-ci ildə açdığı fərdi sərgisi Tur Heyerdalın xatirəsinə həsr olundu. Həmin sərgi STATOİL şirkəti, NHM və Norveçin Azərbaycandakı səfirliyinin sponsorluğu ilə təşkil edilmişdir.

Həmin sərgidə alimin xatirəsinə həsr etdiyi “Til Thor Heyrdahls Minne” əsəri də nümayiş etdirildi. İndi bu əsər KONTİKİ MUSEUM-da saxlanılır.

Son illər NHM ilə birlikdə Mərdəkan 3 saylı internat evində həyata keçirdiyi rəsm dərsləri uşaqların marağına, sevincinə səbəb olmuşdur.

2007-ci il iyun-iyul aylarında NHM-nin təşkilatçılığı ilə Norveç Krallığında səfərdə olmuş, Trisil Sapsburq və Stavanger şəhərlərində fərdi sərgiləri açılmışdır. Bu sərgilər uğurla keçmiş, böyük maraqla qarşılanmışdır. Norveç mətbuatında məlumatlar, rəssamla müsahibələr dərc olunmuşdur.

Yaradıcılığının məhsuldar bir dövründədir. Yeni rəsmlər, heykəllər üzərində işləyir.

Ailəlidir. Həyat yoldaşı Pəri xanım mühəndisdir. İki övladı var. Qızı Əsmər 11, oğlu Əli isə 5 yaşındadır.

**POEZİYA**



**Adil ŞİRİN**

### Laçın dağları

Dumanım harda qaldı,
Gümanım harda qaldı?
Umanım harda qaldı –
Umudum Laçın dağları…

İtirin izlərimi,
Unudun sözlərimi.
Qapasın gözlərimi
Buludun, Laçın dağları.

Yuxumda qar yağır gecə,
Hər gecə bir işgəncə.
O gözəl günləri necə
Unudum, Laçın dağları…

### Tənhalıq

Hardan əsdi bu rüzgar,
Hardan gəldi xəstəlik.
Ömürdən-gündən bezib,
Yaşayırıq hələlik.

Tənhayam yer üzündə,
Təsəlli verənim yox.
Bütün qapılar bağlı,
Üzümü görənim yox.

Nə yaşamağa həvəs,
Nə ölməyə gücüm var.
Halıma yanıb ağla -
Hardan əsdi bu rüzgar?

## Hüseyn KÜRDOĞLU



### Zaman xəstədir

***Adlı-sanlı həkim, qayğıkeş insan, eloğlum İsmayılov Köçəriyə minnətdarlıqla ithaf edirəm.***

Alsan da canımı vaxtsız ölümdən,
Canım neyləsin ki, cahan xəstədir.
Qəlbim sınıq kaman, ruhum qırıq ney,
Versən də min cürə dərman, xəstədir.

Ağrılar hikkədən, qəzəbdən deyil,
Əsildən-nəsildən, nəsəbdən deyil.
Vallah sən dediyin əsəbdən deyil,
Zəmanə xəstədir, dövran xəstədir.

Füzuli naləsi, Vaqif səsiyəm,
O Yanıq Kərəmin od nəfəsiyəm.
Mən həyat eşqinin bir qətrəsiyəm,
Qətrədə nə günah, ümman xəstədir.

Yaman qaçıb qanım, üzümə gəlmir,
Əzəlki taqətim dizimə gəlmir.
Öz dərdim qətrəcə gözümə gəlmir,
Deyirlər sevdiyim ceyran xəstədir.

Göyləri titrədir ana fəryadı,
Fəqət göylərin də yoxdur imdadı.
Qana yerikləyir adəm övladı,
Bütün dünya boyu insan xəstədir.

Qoy Vətən sınasın hünərdə məni,
Möhtac eyləməsin namərdə məni.
Zaman yoluxdurdu bu dərdə məni,
Vədəsiz gəlmişəm, zaman xəstədir.

Kimdir dərdə salan yer üzünü, kim,
Borcluyam yurdumun dərdini çəkim.
Loğman pilləsinə çıxsa da həkim,
Xəstə sağalmasa, loğman xəstədir.

Çoxalır, başımdan aşır dərdi-sər,
Köhlən günlərimdən qalmamış əsər.
İlandan istədim bir damcı zəhər,
Gördüm məndən betər ilan xəstədir.

Yağılar od vurur Vətən mülkünə,
Yetən yox haraya, fəryada, ünə.
Xalqım çıxacaqmı bir yaxşı günə,
Kürdoğlu xəstədir, yaman xəstədir.

### Getdi

Nə gördü dünyadan yazıq Kürdoğlu,
Nə tez bu torpağa üz qoydu getdi.
Çənlibeldən aşdı ilham köhləni,
Sıldırımdan keçən iz qoydu getdi.

İnci qiymətini sərraflar qanar,
Qədrini bilənlər həsrətlə anar.
Sönməz ocağından ocaqlar yanar,
Bədxah ürəklərə köz qoydu getdi.

Dirilik suyudur açdığı bulaq,
Yüz yandan üstümə yol salar qonaq.
Sözün sayına yox, sanbalına bax,
Dünyada bir dünya söz qoydu getdi.

## AŞIQ UMBAY



Umbay Sadıq oğlu Axundov 1941-ci il mart ayının 21-də Laçın rayonunun Qarakeçdi kəndində kolxozçu ailəsində anadan olub. 1946-1953-cü illərdə 7 illik Qarakeçdi kənd məktəbini, 1953-1959-cu illərdə isə Minkənd kənd orta məktəbini bitirmişdir. 1968-ci ildə Həsən bəy Zərdabi adına Gəncə Dövlət Pedaqoji İnstitutunun tarix fakültəsinə daxil olmuş və 1974-cü ildə həmin institutu müvəffəqiyyətlə bitirmişdir.

Gənc yaşlarından aşıq sənətinə böyük maraq göstərən Umbay Gəncəli Aşıq Maisdən 2 il aşıqlıq sənətinin sirlərini mənimsəmişdir. 1971-ci ildə rayonlararası "Gənc Aşıqlar Festivalı"nda birinci yerə çıxmışdır.

1976-cı ildə ümumittifaq festivalının laureatı olub qızıl medal alan Aşıq Umbayın 1989-cu ildə 2 qrammafon valı yüksək tirajla satışa buraxılmışdır. 1992-ci ildə "Laçında dillənən saz" adlı şeirlər kitabı 7 min tirajla nəşr edilmişdir. Azərbaycan Dövlət Televiziyasında "Şah İsmayıl" və "Laçın həsrəti" dastanlarını danışmışdır.

1961-ci ildə III aşıqlar qurultayının və 1984-cü ildə IV aşıqlar qurultayının üzvü olan Aşıq Umbay 2008-ci ildə keçirilən V aşıqlar qurultayının idarə heyətinin üzvü seçilmişdir. Dövlət tədbirlərində mütəmadi iştirak edən Aşıq Umbay hal-hazırda da yazıb-yaratmaqla məşğuldur.

### Bayram günləri

Necə də şirin yaraşır sözə bayram günləri,
Nə qədər sevinc gətirir üzə bayram günləri.
Yaranandan insan oğlu azadlığa təşnədir,
Səadətnən qismət olsun sizə bayram günləri.

İlahi, aç dərgahını, qəbul eylə sözümü,
Ürəklərdə məhv eləmə dəyanəti, dözümü.
Diz çökürəm, yön çevirib sizə sarı üzümü,
Laçınımda qismət eylə bizə bayram günləri.

Aşıq Umbay, xoş arzuya çatmamış ölmək olmaz,
Qəribliyin qəm daşını atmamış ölmək olmaz.
Bir gecə doğma Laçında yatmamış ölmək olmaz,
O gün bizə olacaqdır təzə bayram günləri.

**Onda yada şeir düşür**

Yaltaq uca satır sözü,
Ürəyimi bənd-bənd deşir.
Seçmir əyri ilə düzü,
Xeyri üçün ikiləşir,
Onda yada şeir düşür.

Günahları özü boyda,
Elinə verməyib fayda.
Birdən dəyişəndə qayda,
Sözü ağzında ilişir,
Onda yada şeir düşür.

Beləsi qorxur aynadan,
Gözü doyarmı dünyadan?
Bir də görürsən ki, nadan
Yuxarı başda əyləşir,
Onda yada şeir düşür.

Qəlbdən əyri, dildənsə düz,
Vicdan ləkə, paltar təmiz.
Günahını yumaz dəniz,
Guya xalqın bağrı bişir,
Onda yada şeir düşür.

Kefi duru, damağı çağ,
Özünü düşünür ancaq.
Umbay, beləsindən uzaq,
El malını yeyib şişir,
Onda yada şeir düşür.



Şərahil LAÇIN

### Atadır

Ay anam, qəlbinə qara gəlməsin,
Həyatı övlada verən atadır.
Min-min sevinc ilə bağça-bağ salan,
Fərəhli barını dərən atadır.

O, Tanrı nurudu, o, haqqın səsi,
Dağ yarar qəlbində övlad həvəsi.
Anasız qızının ana əvəzi,
Mehrlə saçını hörən atadır.

Atasız bir ocaq yelkənsiz gəmi,
Odur nurlandıran bütün aləmi.
Övlad gözündəki qüssəni-qəmi
Arıyan atadır, görən atadır!

Nəsihət gizlənər bəzən kinində,
Quşdan qanad alar, o, toy günündə
Özgə ocağında, gəlin önündə
Xalıtək qəlbini sərən atadır.

Şərahil, üstündə odur hey əsən,
Adını adınla birgə daşı sən!
Taleyin hökmüdür, bir gün əyilsən,
Yolunda canını yoran atadır!

### Anamın

Yaz ömrünü illər saldı xəzana,
Qar-qışına qurban olum anamın.
Bu vədəyə, bu sinniyə, bu sana,
Bu yaşına qurban olum anamın.

Üzü ağdır, qüssə-qəm ha sınaya,
Görüm onu qərinələr sanıya.
Oğrun-oğrun o sevdiyim sonaya
Baxışına qurban olum anamın.

O anamdır, kaman kimi dillənən,
Xoş günümdə çiçək açan, güllənən.
Məndən ötrü çaya dönən, sellənən
Göz yaşına qurban olum anamın.

Ay Şərahil, bu nə duman, bu nə çən,
İllərmiydi belə yeltək ötüşən?!
Saçlarına vaxtsız düşən, tez düşən
Naxışına qurban olum anamın!

### Gecələr

Dur gəl gözüm nuru, dur gəl ümidim,
Qurumur gözümün yaşı gecələr.
Gündüzlər yoluna baxdım, kiridim,
Oğulsan bu dərdi daşı gecələr!

Yoxsan, qəm avazlı saza dönmüşəm,
Çox idim, xərclənib aza dönmüşəm.
Donub həsrətindən buza dönmüşəm,
Baharı gecələr, qışı gecələr.

Şərahil, qəm etmə, sevda çağıdır,
Sənsiz nəğmələrim qəmdir, ağıdır.
Yoxluğun köksümü didir, dağıdır,
Göynəyir bağrımın başı, gecələr!



## MAARİF KÖÇKÜN

1960-cı ildə Laçın rayonunun Hacısamlı kəndində anadan olub. 1966-cı ildə valideynləri ilə birlikdə həmin rayonun Hətəmlər kəndinə köçüb.

Maarif Köçkün yaradıcılığa uşaq yaşlarından başlasa da, şeirləri ötən əsrin 90-cı illərində müxtəlif qəzet və jurnallarda, almanaxlarda çap olunub. “Yurdumun baharı yadıma düşür”, “Ötən əsrlərdən gələn sorağam” və “Laçının yollarında” kitablarının müəllifidir.

### QARABAĞ

Ömrümüzün gözəl çağı,
El-obanın bağça-bağı.
Cənnət idi hər bucağı,
Olmusan talan, Qarabağ.

Dərd çəkirəm, qəm yeyirəm,
Vətəntək bölük-bölüyəm.
Gündə neçə yol deyirəm
Mən sənə can-can, Qarabağ.

Kaş gələydi gözəl anım,
Təzələnəydi dövranım.
Uğrunda verərəm canım,
Olsa qana-qan, Qarabağ.

Tarixlərdən öc almısan,
Namərdlərdən bac almısan.
Gözəllikdən tac almısan,
Qoynu gülüstan Qarabağ.

Ömür çata görək bir gün,
Şadlıq edib gülək bir gün.
Köçkün deyir sürək bir gün
Qoynunda dövran, Qarabağ.

## GƏLİB KEÇİR

Nahaqdan məzlumun tökülür qanı,
Terrorun dalğası tutub hər yanı.
Ay fani dünyanın nadan insanı,
Baxıram gözümdən tor gəlib keçir.

Yaxşı bax dünyada gedən savaşa,
Hər yanda basılır müsəlman daşa.
Düşmən kəsilibdi qardaş qardaşa,
Qışqırram, könlümdən car gəlib keçir.

Üzür qan gölündə Fələstin, İraq,
Xoşbəxt güzərandan verən yox soraq.
Ölür kişi, qadın, məhv olur uşaq,
Utannam, qəlbimdən ar gəlib keçir.

Səndən soruşuram, ay yazı yazan,
Bir ömrü axıra vurmuruq asan.
Niyə qənim çıxıb insana insan,
Bu dünya başıma dar gəlib keçir.

Uduruq, boğulur haqq səsimiz də,
Azalmır silaha həvəsimiz də.
Həzm edib zəhəri ciyərimizdə,
Alırıq, nəfəsdən çor gəlib keçir.

Qatillər-şümürlər hələ qan tökür,
Qədim şəhərləri dağıdıb sökür.
Kimi fəryad edir, kimi dərd çəkir,
Kiminin könlündən yar gəlib keçir.

Zövq versin hər kəsə həyatın dadı,
Olmasın ellərin ahı-fəryadı.
Köçkünəm, istəyim azad dünyadı,
Könlümdə gör nələr var, gəlib keçir.

## ƏLƏMDAR BƏYLƏROV



Bəylərov Ələmdar Əhəd oğlu 1959-cu ildə Laçın rayonunun Alxaslı kəndində anadan olmuşdur.

1980-ci ildə Xankəndi Pedaqoji İnstitutunun filologiya fakültəsini bitirmişdir.

Müxtəlif mətbuat orqanlarında yüzə yaxın bədii və publisistik yazısı dərc edilmişdir.

2001-ci ildə "Bənövşə ətirli məhəbbətimsən" adlı şeirlər kitabı işıq üzü görmüşdür.

Ələmdar Bəylərov 2010-cu ildə vəfat etmişdir.

### Dərdin alım, olan oldu

Bilinəcək geci-tezi,
Kim qumara qoydu bizi.
Kimə deyək dərdimizi?!
Ürəyimin dərdi boldu;
Dərdin alım, olan oldu !

Həyat yalan, ölüm gerçək...
Ellər gedir, köçünü çək.
Qan ağladı çəmən, çiçək
Xan çinarlar saçın yoldu;
Dərdin alım, olan oldu!

Dağın, suyun - hər nemətin
İtkisini çəkmək çətin.
Neçə-neçə məhəbbətin
Qönçələri yanıb soldu;
Dərdin alım, olan oldu!

Başı endi ucaların,
Odu söndü bacaların.
Könlü düşkün qocaların
Əli əsdi, gözü doldu;
Dərdin alım, olan oldu!

Ölüm bizə yol yoldaşı,
Aman vermir addımbaşı.
Dolanırıq dağı, daşı,
Can şirindi, uzaq yoldu;
Dərdin alım, olan oldu!

### Ürəksənmiş

Gözəlliyin özü sandım,
Bilməz idim mələksənmiş!
Açılmısan bahar kimi,
Başdan-başa çiçəksənmiş!

Gəl, azalsın ağrım, acım,
Gəlişinə qollar açım.
Bacarmadım səndən qaçım,
Gördüm mənə gərəksənmiş.

Bir ömürlük sevdan olum,
Sevgin ilə yaşa dolum.
Məhəbbətim, ömür yolum,
Ürəyimə ürəksənmiş.

ƏDƏBİ GƏNCLİK

## SEVİNC ARİFQIZI



Feyzullayeva Sevinc Arif qızı 1980-ci ildə Laçın rayonunun Təzəkənd kəndində ziyalı ailəsində dünyaya gəlib. Laçın rayon Elşən Süleymanov adına orta məktəbi bitirdikdən sonra Gəncə Dövlət Universitetinin filologiya fakültəsinə daxil olub. 2003-cü ildə təhsilini bitirib, Azərbaycan dili və ədəbiyyatı müəllimi kimi fəaliyyətə başlayıb.

2004-cü ildə "Könül yaram" adlı ilk kitabı işıq üzü görüb.

### BƏNÖVŞƏ

Niyə qəmli-qəmli mənə baxırsan,
Niyə pərişandı halın, bənövşə?
Yoxsa mənim kimi yardan olmusan,
Durub gözləyirsən yolun, bənövşə?

Niyə gözlərinə qəm-kədər çöküb?
İncə ləçəyinə qanı kim töküb?
Niyə məzlum-məzlum boynunu büküb,
Dibində yatmısan kolun, bənövşə?

Səni tək qoyubmu ömür sirdaşın?
Üzünə axıbmı qanlı göz yaşın?
Mənimtək bəlalar çəkibmi başın?-
Qırılıb qanadın, qolun, bənövşə.

Yaşıl çəmənlikdə tənha qalmısan,
Səndəmi taleyə qurban olmusan?
Şirin nəğmələri lap unutmusan,
Ağılar söyləyir dilin, bənövşə.

Sevincəm, həyatdan heç kam almadım,
Həyatın ləzzətin bütöv dadmadım.
Yanında nahaqdan mən dayanmadım,
Oxşayır halıma halın, bənövşə.

## UCALIQ

***Hər zaman haqqın, ədalətin tərəfdarı olan, düz əqidəsi, insani keyfiyyətləri, səmimiliyi ilə təkcə bizim deyil, ümumiyyətlə bütün Laçın sakinlərinin qəlbində taxt quran atam - Feyzullayev Arif Xəlil oğluna ithaf edirəm. Biz səninlə fəxr edirik, həmişə, hər zaman sənə layiq olmağa və bizə göstərdiyin düz yolla getməyə çalışırıq. Özün dediyin kimi "Ən gözəl xoşbəxtlik vicdan rahatlığıdır!" Yaxşı ki, varsan! Biz səni sevirik!***
***Övladların: İlhamə, İlham, Sevinc və Amil.***

Maya təmiz, vicdan təmiz, ad təmiz,
Kirli yamaq qəbul etməz ucalıq.
Rast gəlsə də zaman-zaman borana,
Minnətlisə, kürkü geyməz ucalıq.

Sözdə "mənəm-mənəm" deyən çox olar,
Hər sınaqda bu "mənəmlər" yox olar.
Nakişilər çıxa bilməz, yıxılar,
Qartal sevər, sərçə sevməz ucalıq.

Zaman sınar, verər ələk, verər dən,
Haqq ələyər, haqq keçirər ələkdən.
Hər məkrdən, hər qurulan kələkdən
Kənar durar, böhtan bilməz ucalıq.

Nəfs aldatmaz, haram tikə yeyilməz,
Nazilsə də o bir haqdır, üzülməz.
Müqəddəsdir, hər kəsə bəxş edilməz,
Hər kəsə də qismət olmaz ucalıq.

Ata, sənə o yamanca yaraşır,
Bu təzadda fikirlərim qarışır.
Yoxsa iki zirvə birgə yarışır,
Ha çatsa da, səni ötməz ucalıq.

## MƏHƏMMƏD MİRZƏYEV



Məhəmməd Ağəli oğlu Mirzəyev 1965-ci ildə Laçın rayonunun Ərdəşəvi kəndində anadan olub. BDU-nun filologiya fakültəsini bitirib, ixtisası üzrə müəllim işləyib.

1995-1997-ci illərdə Ərdəşəvi kənd orta məktəbində direktor vəzifəsində çalışıb. 2005-ci ildən Laçın rayon 10 №-li tam orta məktəbində dərs hissə müdiridir. Yaradıcılığa gənc yaşlarından başlayıb.

### Dünya

Heç kəsə sirrini verməyib hələ,
Əzəldən dilsizdi, laldı bu dünya.
Xəyanət eyləyib insan ömrünə,
Şahmar ilan kimi çaldı bu dünya.

Qoynunda insana hörmət bəsləyər,
Dar gündə aldadıb zülmə səsləyər.
Od vurub Kərəmə, bir də Əsliyə,
Məcnunu çöllərə saldı bu dünya.

Xeyrindən çəkinməz, şərdən bac almaz,
Heç kəsin gözündə qalxıb ucalmaz.
Əsrlər keçsə də, yenə qocalmaz,
Hələ yetişməyib, kaldı bu dünya.

Bir gözü işıqdı, bir gözü zülmət,
Yaxşıya, yamana vermədi qiymət.
Kiminin gözündə həmişə zillət,
Kiminə şəkərdi, baldı bu dünya.

Məhəmməd, ömrünün yolları qısa,
Xeyrindən çıxmamış tez düşdün yasa.
Əgər Süleymana qalmayıbdısa,
Biləydim kimlərə qaldı bu dünya.

## Telefon

Neçə il həyatda ayrı düşmüşük
Yaxşı ki, itməyib telefon nömrəmiz.
Kəsilmir zənglərin ardı-arası,
Telefon sonuncu ümid yerimiz.

Götürəm dəstəyi, yığam nömrəni,
Səninlə doyunca danışa biləm.
Səsin kədərimi ovuda bir az,
Küskün taleyimlə barışa biləm.

Susursan səsimi eşidən kimi,
Telefon yanında keçir hər gecəm.
Yadına gəlirmi, deyirdin gülüm,
Həmişə zəngini gözləyəcəyəm.

Bəs niyə susursan, danışan mənəm,
Əhdimə yalançı olmadım, xeyr.
Bu vaxtsız, vədəsiz telefon zənginə,
Bilirəm ürəyin gileylənməyir.

Bu telefon zəngləri qarma-qarışıq,
Həmişə sözümü yarıda kəsdin.
Hələ ki, doyunca danışmamışdıq,
Bəs "sağ ol" deməyə niyə tələsdin?

Siləcəm nömrəni cib dəftərindən,
Xatirən qəlbimə yazılı qalsın.
Zəng etmə, dəstəyi götürməyəcəm,
Ürəyin telefondan asılı qalsın.

Özgə bir ünvana üz tutum, demək,
Bu gecə telefonla tək qalacağam.
Səni həmişəlik unutduğumtək,
Telefon nömrəni də unudacağam.



**Vəliş ZİRVƏLİ**

## Bildiyin

Oğullar var idi saysız, hesabsız,
Ən uca, basılmaz qala bildiyin.
Hanı o gözəllər - büllur dodaqlı,
Hanı o yanağı lala bildiyin?

Öyrəşdi kədərə gözüm, bilmədim,
Dərd məni kövrəltdi, dözüm bilmədim.
Dünya nə vermişdi özüm bilmədim,
Hey aldı əlimdən ala bildiyin.

İllərdi dərd çəkir Vəliş, xəstədi,
Bir gəlib-gedən yox, qulaq səsdədi.
Dağlara deyin ki, son nəfəsdədi,
Ən əziz, ən doğma bala bildiyin.

## Kimi

Könül, çox bağlanma yaz havasına,
Qış gəlsə qəbul et qışı qış kimi.
Göylərin sevincdən yaşaran gözü
Nur töksün üstünə ağ yağış kimi.

Duymaz bu hikməti hər naşı, nadan,
Yaşayar qəlbində sevgi yaşadan.
İnsantək gəlmişik, qoca dünyadan
Bir gün də gedərik yaranmış kimi.

Vəlişin dünyaya gəlməyini sən,
Acı taleyinə gülməyini sən,
Doğulub sonradan ölməyini sən
Qəbul et sonuncu aldanış kimi.

**Kərəm ARXUD**
**(Zamanov)**

## Yaraşmır

“Laçın” mahnısına sünnətdə, toyda
Oynamaq yaraşmır, süzmək yaraşmır.
...Yurdumuz-yuvamız gedib o boyda,
Qeyrəti olana dözmək yaraşmır.

O təkcə mahnı yox, Laçın fəryadı,
Oyatsın qəlblərdə yaddaşı-yadı.
Qoymayın tarixdən silinsin adı,
Dünəni bu günə çözmək yaraşmır.

Bir haray, bir həşir qopur bu səsdə,
Haqqını tələb et, haqqını istə.
Torpağın qoynunda, torpağın üstə
Haqqı olmayana gəzmək yaraşmır.

Kişi odur əyri qoya papağı,
Qoruya Vətəni, ana torpağı.
Tək bircə çiçəyi, bircə yarpağı
Sahib olmayana üzmək yaraşmır.

Kərəm Arxud, Vətən səni qucuya,
Vətənsizlər Vətən üçün acıya.
Uyub qafiyəyə, bölüb hecaya
Hər sözü şeirə düzmək yaraşmır.

**Arif İBRAHİMLİ**



### Ağla, dağlar

Bu necə tükənməz yoldu,
Bağım-bağçam vaxtsız soldu,
Həsrət mənə həmdəm oldu.
Qəlbimdədi dağlar, dağlar,
Ağla, dağlar, ağla, dağlar.

Arzularım donub dildə,
Gözüm qalıb üzdə, əldə.
Can verirəm qürbət eldə,
Gözlərimi bağla, dağlar,
Ağla, dağlar, ağla, dağlar.

Hər qayan bir beşik mənə,
Hər daşın ev-eşik mənə,
Gəl özün çək keşik mənə.
Məzarım ol, saxla, dağlar,
Ağla, dağlar, ağla, dağlar.

### Ellərim didərgin olub.

“El yolu”nda el axtarma,
Ellərim didərgin olub.
Bülbülləri qəfəsdədi,
Güllərim didərgin olub.

Dərdim, qəmim özümdədi,
Sevinc, vüsal sözümdədi,
Xan Həkəri gözümdədi,
Sellərim didərgin olub.

Ağlar qalıb dağlar, daşlar,
Dağlar bizi dağlar, daşlar.
Bəs hardadı daşlı başlar?
İllərim didərgin olub.

**ƏDƏBİ DÜŞÜNCƏ**

## "YAZA PƏNCƏRƏTƏK AÇILIB SƏHƏR"

Çoxsaylı poeziya pəncərəsində, bu gurhagurda, bu qaynarlıqda şair adını qazanmaq və bu adı öz ömrünün mənasına çevirmək bu gün - XXI əsrin başlanğıcında çox müşkül məsələdir. İndi hamı yazır, bəzən əsl yazanlar qalır qıraqda (onlar kitablarını çətinliklə çap etdirirlər, əsl şairə xas olan təvazökarlıq xislətinə həmişə sadiq qalırlar), özgə dimdiyindən misralar qoparan nəzmkarlar isə keçirlər ön sıraya (əməlli-başlı təbliğ olunur, yubileyləri və kitablarının təqdimatı keçirilir, Yazıçılar Birliyinə də qəbul olunurlar). Ancaq təbii ki, bütün zamanlara xas olan bu çoxluq hələ kəmiyyətdir, keyfiyyət deyil. Təbiətdə də belədir. Bir meşəyə daxil ol, orada bütün ağaclarmı gözünü və könlünü oxşayacaq? Yox, yalnız təbiətin hüsnü olan ağaclar... Bir gülüstana get, orada bütün güllər, çiçəklər sənə eyni zövqü bəxş etməyəcək.

Elman Elsevər adlı dostumun şeirlərini oxuyanda bu hissləri keçirdim və sevindim ki, bu şeirlər onun özünə məxsusdur, özgə dimdiyindən qoparılmayıb, ürəyindən keçib şeirə çevrilib.

Mən dost sözünü işlətdim. Ancaq bu "dost" sözünün Elmanın şeirlərinə heç bir dəxli yoxdur. Mən bilirdim ki, tələbəlikdən tanıdığım Elman şeir yazır, amma necə yazır bilmirdim. Harada çap etdirir bilmirdim. Və ümumiyyətlə "şair" sözünü Elmanın adının qarşısında yanaşı işlətməyi ağlıma belə gətirmirdim. Lakin günlərin bir günü... tələbə dostum Elman şeirlərini mənə göstərdi. Çox ciddi şəkildə - Vaqif, bu şeirlərdən üzə çıxarılası varsa çıxar, - dedi, - yoxdursa cırıb at.

Oxudum və sevindim. Çünki onun yazdıqları şeir idi. Bunları mənə yox, istənilən şairə, tənqidçiyə göstərsəydi belə, o da mənim kimi sevinərdi.

Kəfənə bürünüb gədiklər, gözlər,
Boz yük ulasları yerə əyibdir.
İnləyir qar altda cığırlar, izlər,
Qasırğa kəndləri ütüləyibdir.

Dağlarda qış mənzərəsini təsvir edən bu şeirdə poeziya üçün lazım olan bütün elementlər göz oxşayır. Bənzətmələr, epitetlər, müqayisələr - bir sözlə, gözəl bədii təsvir vasitələri səni özünə çəkir. Adi sözlər, ifadələr sıralanır və şeirdə qeyri-adi mənzərə yaradır.

Bakıda soyuğa dözməyə nə var,
Buludlar Laçında yaman dəlidir.

Gördüyün sərkərdə, igid qayalar
Sönmüş vulkanların daş heykəlidir.

Vurub qoltuğuna boz goreşəni,
Yamacda sülənir şimal ayısı.
Niyə ilanlığın başına vurmur,
Nəyi gözləyirsən, İlan qayası?!

Düşüb çəhliminə yağı əliyin,
Qırxqız meşəsində ona tuş oldu.
Qırmızı palıdlar, göylərə deyin: -
Bu nə uzun çəkən soyuq qış oldu.

Gözəl şeirdir və bu şeir təbiətin dilini bilən bir şairin dilindən qopur. Maraqlıdır ki, dağlar oğlu Elman (O, Laçındandır) mənə təqdim etdiyi (bu şeirlər baş redaktor müavini işlədiyim “Azərbaycan” jurnalının 1999-cu il 10-cu nömrəsində çap olundu) şeirlərində Laçını, Kəlbəcəri xatırlatdı, mənə elə gəldi ki, o gözəl təbiətdən Elmana çox şey bağışlanıb. Elman Laçının bir parçasıdır - dağıyla, çölüylə, düzüylə, qarıyla, yağışıyla, payızıyla, baharıyla. (İndi Laçın dustaqdır və hər dəfə Elmanı görəndə mənə elə gəlir ki, o da dustaqdır və bu dustaq Elman haçansa özünü də azad edəcək, Laçını da).

Sonrakı illərdə mən Elmanın şeirlərini “Ulduz” jurnalında da oxudum. Təbiət şeirləri ilə yanaşı Elmanın müxtəlif mövzularda yazdığı şeirləri ilə də tanış oldum. Qarşımda təkcə gözəl şeirlər yox, həm də bir şair obrazı canlandı. Bu şair şeirə-sənətə təsadüfi gəlmədiyini sübut edir. Bu şair xalq şeiri ənənələrindən qopub gəlib, həmçinin modern şeiri də qədərincə bilir. Bu şair ətraf aləmə - dünyaya, gerçəkliyə, dünənə, bu günə, gələcəyə özünün şair gözləri ilə baxa bilir, adidə qeyri-adiliyi, sadədə mürəkkəbi, anda zamanı, damlada dəryanı görməyə can atır və çox vaxt təşnəlik şeirə çevrilir, bu can atma poeziya dilində peyda olur.

Qışa qapı kimi
qapanıb gecə.
Yaza pəncərətək açılıb səhər -
ürəyi isidir ilıq şəfəqlər.
Üşüdür üzü
sübh ayazı.
Alçalar çiçəklənib.
Göyərib dodaqları
çılpaq budaqların.
Gilas dəyənədək...

tut yetişincə,
söz-söz geyindir əyniyuxa
tifilləri -
gülsün gözləri
əlini burax,
yıxıla dura,
misra-misra
qaçıb oynasın özləri.
Tutun dəyməyinə ta nə qalıb ki...

Bu, Elmanın sıravi şeirlərindən biridir, amma ona layiq olan şeirdir.

"Laçınım, mən sənə qayıdacağam" şeirində Elman içindəki dərdini bölüşür. Bu dərd bizim də içimizdə kök salıb, amma Elmanın dərdi qədərincə olmaz. Elman da həmin şeiri ona görə yazıb ki, bizim Laçın dərdimiz Elmanın Laçın dərdi ilə tən olsun.

Kəməndəmi salıb könlümü saçın -
Möhnətin içimi içimdən otlar.
Soyuq nəğmə deyir Ulduzlar, Laçın,
Çimir soyuq nurda çiçəklər, otlar.

...Yağır sarı-sarı, yağır şıdırğı,
Həkəri gözümdə dumana dönür.
Sinəmdə alışan inam çırağı
əriyib, sozalıb gümana dönür.

...Yox, yox, ulu Yurdum, ulu Ocağım,
Dağlı qəzəbimi oyadacağam.
Yarıb qaranlığı - ildırım təki
Mən Sənə, mən Sənə qayıdacağam!

Laçına qayıdacağıq. O zaman Ağa Laçınlı doğrudan da elə Ağa LAÇINLI olacaq, o zaman Elman şeirlərində vəsf etdiyi o gözəllikləri mənə nişan verəcək (ömrümün acı bir cizgisidir ki, Laçını, Kəlbəcəri, Qubadlını, Xankəndini görməmişəm), biz poeziyanı da Laçın dərdindən qurtaracağıq.

O gün uzaqda deyil, Elman!

Mən sənə şeir-sənət yollarında inam, qətiyyət, qələbə arzulayıram.

Şair adını uca tut.



**Vaqif YUSİFLİ**

# YARIMÇIQ ÖMRÜN YAZ NƏĞMƏSİ

Bir ovuc torpağın, bir parça səmanın, ətirli çəmənlərin, qürurlu qayaların, qar zirvəli dağların məhəbbətini doğulduğu Laçından Bakıya gətirərək ilhamının işığına bürüyən və bu gözəlliklərə könül oxşayan nəğmələr qoşan şair Malik Fərrux ildırım vurmuş bir ömür yaşadı. Bu qış nakam taleli şairimizin 60 yaşı tamamlandı, həyatda isə heç 50-yə çatmadı.



Bakı Dövlət Universitetinin jurnalistika fakültəsini bitirmişdi. Əvvəldən-axıra bir iş yeri oldu: Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Komitəsi. Burada kiçik redaktordan böyük redaktora qədər bir iş ömrü yaşadı. Tələbəlikdən dövri mətbuatda şeirləri, publisistik yazıları dərc olunurdu. Sağlığında iki şeir kitabının sevincini duydu. Yaxın dostları onu öz aralarında "Laçın qartalı" çağırardılar. Sanki yaranışı Tanrının xoş ovqatına düşmüşdü. Uca boylu, yaraşıqlı, gur saçlı, bir az da qalın səsli Malik Fərrux Laçın qayaları kimi qamətli idi. Qələm yoldaşları xətrini çox istəyirdilər. Həssas təbiətə malik şair qardaşımız hansı mətbuat səhifəsində bir uğurlu yazımızı oxusaydı, dərhal zəng edib fikrini bildirər, adamı yeni mövzulara ruhlandırardı.

İstər poeziyasında, istərsə də publisistikasında Vətən səsi, yurd sevgisi, el-oba nəfəsi duyulardı. O, Laçından şəhərə gəlmiş bir laçın oğlan idi. Burada xoşbəxtliyini tapsa da, ailə-uşaq sahibi olsa da, ürəyindən su içən qələmi həmişə o dağlardan, o təbiətdən yazırdı. Bütün varlığı ilə doğulduğu yurda bağlı idi Malik Fərrux.

"Yuva nəğməsi" adlı bir şeirində uşaqlıq illərini, anasını, beşiyini poetik yada salan Malik Fərrux boy atıb yeridiyi doğma torpağı cazibə məkanı kimi tərənnüm edib. Dağlar qoynunda qanad açmağını elə burada da son mənzilə qovuşmağın xoşbəxtliyi kimi dəyərləndirib. Təəssüf ki, bu ona qismət olmayıb. Bütün şeirlərində Laçına boylanan, tanış cığırlarla dönə-dönə o yerlərə gedən Malik Fərrux yazırdı:

***Orda boy atdıqca mən yavaş-yavaş,***
***Könlümə bir dünya dolurmuş demə.***
***O layla, o muğam, o torpaq, o daş,***
***Dönüb Azərbaycan olurmuş demə.***

Düzənlərə ana qucağı, dənizlərə ana arzuları kimi dəyər verən müəllifə görə, başının üstündə parlayan günəş də ana baxışları kimi onu izləyir. Bu səbəbdən də harada yaşamasından asılı olmayaraq, fikri-zikri yurdun başına dolanırdı. Çünki Vətənə ana demişik. Bu sarıdan özünü Vətənə borclu sayırdı. Malik Fərruxun "Analı dünyam" adlı şeirində maraqlı fikirlər, poetik deyimlər, bənzətmələr diqqət çəkir:

***Dünyamın yaz fəsli - ana gülüşü,***
***Dünyamın qış fəsli - ana ahıdır.***

Laçın dağlarına bəlkə də Malik Fərruxdan çox şeir qoşan ikinci bir şair olmayıb. Müəllifə görə, əsl şeir məhz dağlarda dünyaya gəlir. Elə şair də dağlarda doğulur. Buna səbəb dağların əzəldən sərkərdələrin, qəhrəmanların oylağı olması, neçə-neçə olaya, hadisəyə şahidliyi, bütün çək-çevirlərdən qalib çıxaraq mərd dayanması onu ilham oylağına çevirir:

***Sözü misra-misra deyir dağlarım,***
***İlhamı şəlalə, saçları qardır.***
***Bu nəğmə dağların, şeir dağların,***
***Uca zirvələri şah misralardır.***

İllər boyu poeziyamızda ayrılıq çayı kimi oxşanan Araza bayatılarımızdan üzü bəri yüzlərlə şeir qoşulub. Sovet dövründə gənc bir şairin Araz mövzusunda düşünməsi, şeir yazması, təbii ki, onun milli təfəkküründən, vətənpərvərliyindən, soy-kökə bağlılığından xəbər verir. Malik Fərrux "Arazı gecə gördüm" adlı şeirində könlünü yandıran bir nisgilin ağrı-acısından qəmlənərək qardaşın qardaşla görüş yolunda daş bağlamış həsrətini çox incə duyumlu misralarda dilə gətirir:

***Arazın bir dalğasıyam, axım doyunca,***
***Araz olub, ömür eləmək yaman ağırdır.***
***Gecə vaxtı bir gümüşü həsrət boyunca,***
***Yollar axır, qatar axır, zaman axırdı.***

Malik Fərruxun birinci kitabı 1977-ci ildə çap edilib. "Pəncərədən qızlar baxar" adlı bu əl boyda kitabçada müəllifin geniş ürəyinin çırpıntıları duyulur. Özünü torpağa bənzədən şair səsinə "Heyratı"dan, "Cən-

gi"dən, gözünə isə torpağın rəngindən nəyinsə keçdiyini vüqarla bildirərək Vətəni qarış-qarış gəzməkdən böyük sevinc, xoşbəxtlik duyduğunu dilə gətirir. Çünki haradasa bir ovuc torpağa "Vətən" deyən var.

Onun ikinci kitabı "Bir payız günü" adlanır. Bu şeirlər toplusunda da Vətən məhəbbəti dil açmaqdadır. Bəzən də yurdda özünə bir hesabat dərsi qurur. Bu sorğu-sualların ahəngindəki Vətən dərsi oxucunu düşündürməyə bilmir. Bir hasarın dibində, bir çəpərin önündə öz-özünə sual verir: yurddan uzaqda nə itirdik, nə qazandıq? Ayların, illərin ayrılığında qazandığı bütün uğurların mayasını doğma ocaqda görür. Arzularının dalınca uzaq-uzaq yerlərə uçub getsə də, qəlbinin Laçında döyündüyünü bəyan edir:

***Dünyanın sal qaya ovcundayam mən,***
***Könlümün göylərtək dolan çağıdır.***
***Nəğmə də, şeir də ta gərək deyil,***
***Elə o bəsdir ki, Laçındayam mən,***
***Laçında payızın oğlan çağıdır.***

Şeirin bu misrası bizi kövrəldir. İndi dağlar gözəli Laçının düşmən tapdağı altında saralan, qaralan çağıdır. Cismi şəhərdə, ruhu Laçında dolaşan Malik Fərruxun şeirlərində qəribə bir yaz nəfəsi var. Adama təsəlli verən də budur. Çünki baharda hər şey təzədir, tərdir. Ömrü yarıda qırılmış şairimizin şeirləri də min il ötsə belə, həmişə bizim üçün yenidir. Çünki bu şeirlər Vətən məhəbbətindən poetik libas geyinmiş əbədiyyət dastanıdır.

**Flora XƏLİLZADƏ**
***"Azərbaycan" qəzeti,***
***11 fevral 2009-cu il.***



**Orxan CƏBRAYILOV**



## YANĞI

Taxtakörpüdən üzü yataqlara sarı daha bir çağırış üçün yol almışdıq. Xəbər gəlmişdi ki, Həsən kişinin vəziyyəti yenə ağırlaşıb. İki ildən bir az artıq idi ki, bu yerlərdə işləyirdim. Yataqlar arasında fəsillərdən asılı olaraq tozlu-torpaqlı, zığlı-palçıqlı, uzun-incə bu yollarda var-gəl etmək adi hal almışdı mənim üçün. İnsan ürəyinə az da olsa fərahlıq gətirməyən ucsuz-bucaqsız çöllərə baxdıqca, qəribə duyğuların girdabında haldan-hala düşürdüm. Bu yerlərdə oba-oba məskunlaşmış insanların özlərinə məxsus yaşayış tərzləri vardı. Bu insanlar hələ Sovetlər birliyinin dövründən, sovxoz və kolxozların qaz vurub qazan doldurduğu zamanlardan bələd idilər bu yerlərə. Payız gələndə mal-qaranı qış yataqları adlanan bu yerlərə gətirib, yazın gəlişi zamanı öz ata-baba yurd-yuvaları olan Laçın yaylaqlarına geri dönərdilər. Elə bir dövr gəldi ki, çərxi fələk tərsinə dövran elədi. Bu yataqlarda doğulub boya-başa çatan, buranı özləri üçün yurd-yuva sanan uşaqların ata-anaları, nənə və babaları payızın gəlişinə hələ bir neçə ay qalmış köç etmişdilər bu yerlərə. Zamanın nizam tərəzisi pozulmuşdu sanki...

Zamanın nizam tərəzisinin pozulduğu həmin dövrdən keçən bu müddət ərzində çox şeylər nizama düşsə də, yazla payız arasında nizamı pozulmuş bu insanların nizam tərəzisi düzəlmirdi ki, düzəlmirdi... Payız gedir, qış gəlir, aylar kecib il olur, yazın gəlişiylə öz dogma yurd-yuvalarına köç edəcəkləri günün arzusuyla, bax beləcə fəsil-fəsil yola vermişdi 19 illik zaman kəsiyini bu insanlar.

Həsən kişi də 19 il öncə yazla-payızın tərs düşdüyü zamanda pənah gətirmişdi bu yerlərə. El arasında sayılıb-seçilən ağsaqqllardan biri idi Həsən kişi. Ağayana hərəkətləri, ədəb-ərkanı, xoş və məzəli söhbətləriylə hələ gənc yaşlarından insanlar arasında hörmət qazanıb, ehtiram sahibi olmuşdu. Cavanlığından ağız dolusu danışırdı onu tanıyan hər kəs.

Bəlanın bəla arxasınca gəldiyi zamanlar, daha bir ağır bəlaya düçar olmuşdu Həsən kişi... Qaçqınçılığın 2-ci ilində şəkərli diabet xəstəliyini aşkar etmişdi həkimlər onda. Çox yerlərə getmiş, çox təbiblərə müraciət etsə də, dərdinə dərman edib, içindəki yanğını söndürəcək bir təbib tapılmamışdı.

Kəhər atın belində dağlarda pərvaz edən, Laçının buz bulaqlarının üstündə məclis qurub, quzu kababınnan yeyib, araq şüşələrini böyrü üstə qoyan, dağlar qədər əzəmətli görünən bu kişi, nizam tərəzisinin pozulduğu bir dövrdə zamanın acı tənəsi ilə üz-üzə qalmış, yardıma möhtac məzlum bir insana çevrilmişdi. 1 qutu teksun, 2 tay un, 1 tay düyü, xaricilərin göndərdiyi digər "naz-nemətlər" və zəhrimara qalmış bu insulin hormonu üçün saatlarca növbədə qalar, növbə zamanı baş verən tragikomik tamaşanı seyr etdikcə yazıqlaşar, yazıqlaşdıqca bu zıbbıltının bilavasitə iştirakçısına çevrilərdi. Bu teatr tamaşasında onun payına düşən rol isə kənardan baxan yazıq kişi rolu olardı.

İçində bir yanğı hissi vardı Həsən kişinin... Vətən, torpaq, yurd-yuva yanğısı... Su yanğısı...

Yanğısının sönəcəyi ümidi ilə, içdikcə içirdi aran torpağının artezian quyularından çıxan suyundan. Tərslikdən su da qıt idi bu torpaqlarda.

Yuxularında da bulaq görürdü, su görürdü Həsən kişi... Kəhər atını minib, Laçın dağlarına sarı yol alar, az gedər, çox gedər, gəlib Həkəri çayının sahilinə çatardı. Əyilib bir udum su içmək istərkən baxardı ki, quruyub suyu Həkərinin. Atını üzü dağlara sarı çapardı. Həmişə suyundan ağız dolusu danışdığı Göybulaqdan bir udum su içmək üçün nəfəsi yanıq gəlib Göybulağa çıxardı. Atdan enib, dizini yerə qoyar, əyilib illərdən bəri həsrətində olduğu Göybulağın suyundan bir udum içmək üçün qurumuş dodaqlarını, yanğıdan cadar-cadar olmuş dilini suya yaxınlaşdırar, elə bu dəm yuxudan ayılardı...

Dünya başına fırlanardı Həsən kişinin. Gözləri qaralıb, nəfəs alması çətinləşərdi. Əlləri əsə-əsə kiçik bir şprisə insulin hormonundan 20 təsir vahidi çəkib, bədəninə yeridərdi. Elə ki canına bir az rahatlıq gələr, yenə ümid etməyə başlayardı. Bu dəfə içə bilmədim, gələn dəfə yuxumda da olsa mütləq içəcəm Göybulağın suyundan, - deyərək, özü-özünə təskinlik verərdi.

Qış ayı idi, maşınımız mənzil başına çatmamış yolda xarab oldu. Yataqdan arxamızca maşın göndərmələri üçün Həsən kişinin qardaşına zəng vurmalı olduq. Yolun geri qalan qismini "Qaz 53"-nən davam edib, zığa-palçığa bata-bata BMT-nin, ATƏT-in, Avropa Şurasının, nə bilim daha nə mənəciklərin xəbərsiz olduqları, 15-20 daxaldan ibarət olan yatağa gəlib çatdıq. Çatmasına çatdıq...

Lakin...

İtlərin hürüşməsi, arvadların çığır-bağırı, aləmi bir-birinə qatmışdı, yatağın tam ortasında vurhavur, vay-şivən varıydı. Maşından aşağı təzə

enmişdim ki, əlində ağac yekəpər bir oğlanın üstümə şığıyıb, ağacı təpəmə endirməsinə bir an qalmış, uca boylu, enli kürək bir kişinin göz qırpımında oğlanın qarşısına keçib ona vurduğu şillənin sədası, yatağı sükuta qərq elədi... Sanki qorxunc bir yuxu görürdüm, şillənin sədası və yaranmış sükut ayıltdı məni.

Nəyin baş verdiyini tam anlamında dərk edirdim. Artıq bir cüt göz torpaq, yurd-yuva, Göybulağın suyundan bir udum içmək arzusu və zəhrimara qalmış bu insulin yanğısı ilə gözlərini əbədiyyətə qapamışdı.

Qəlbimdə bir sızıltı və həkim soyuqqanlılığı ilə rəhmətliyin yaxınlarına, qohum-əqrəbasına, acısını aqressiv hisslərlə təzahür edərək başıma ağacla vurmaq həddinə gəlmiş, rəhmətliyin yekəpər oğluna baş sağlığı verib, sanki "bir az tez çata bilsəydim, bəlkə də kömək edə bilərdim" düşüncəsiylə daxilən özüm-özümü tənbeh edə-edə üzü Taxtakörpüyə sarı yol aldıq. Yol boyu Həsən kişinin yuxusunda Göybulağın suyundan içə bilib, ya bilimədiyi sualı mənə heç cür rahatlıq vermirdi...

İş otağına daxil olub, yerimi rahatladım. Mənə narahatçılıq verən düşüncələrdən ayrılmaq üçün televizoru açdım. Kanalları ələk-vələk edərkən, kanallardan birində üç kişi gördüm. Nəyə görəsə hırıldayırdılar. Fikrim yayınıq idi, aparıcının dediklərindən sadəcə həmsədrlər sözü beynimə girdi. Deyəsən kişilərin biri rus, digəri amerikan, keçəl olanı isə fransız idi.

Bu kadrlara baxdıqca nədənsə ağlıma ilk düşən Həsən kişinin yekəpər oğlu, əlindəki ağac və arsızcasına hırıldayan bu üç kişinin kəlləsi oldu...

**Elşən HƏMİDOV**



## VƏTƏN HƏSRƏTİ

18 may 1992-ci ildən illər keçməsinə baxmayaraq Laçın dünənki kimi mənim gözümün qabağındadır. May ayı ilin və fəsillərin ən gözəl ayıdır. İnsanların təbiətlə, gözəlliklə ünsiyyətdə olduğu ən munis ay və bir də bu ayın 18-ci günü. 1992-ci il 18 may, həsrətin başlandığı, ağır bir elin yurd-yuvasından didərgin düşdüyü bir gün. Bəli, bir tərəfdə təbiətin sözə gəlməz dərəcədə gözəlliyi, o biri tərəfdə bu xəyali, əlçatmaz gözəlliklər içərisində çırpınan nisgilli bir ürək, didərgin qəlbinin acı fəryadı. Laçın dağlarından biz may ayında ayrıldıq.

Ayrıldıq deməyə dilim də gəlmir, cismimiz ayrılıb. Ruhumuz, fikrimiz, xəyalımız daim o yerlərdə dolaşır. Doğma ata-baba yurdundan ayrı düşmək çox çətindir. Bu gün Laçının xalqımıza bəxş etdiyi qəhrəmanları, şair və yazıçıları, məğrur kişilərini saymaqla bitməz. Laçın milli qürur yerimiz, mənəvi paklığımızın zirvəsi sayılırdı, desəm, səhv etmərəm. Laçın yaşayırdı, yaradırdı, ucalırdı. Çox təəssüf ki, indi ancaq şairlərimiz, yazıçılarımız Laçının həsrətindən, işğalından yazırlar.

Neçə illərdi biz Laçının həsrəti ilə yaşayırıq. Mən inanıram ki, vaxt gələcək biz yenə öz doğma ata-baba yurdumuza dönəcəyik. Bunun üçün böyükdən-kiçiyə hamımız vətənpərvər olmalıyıq, işğal olmuş torpaqlarımızı geri qaytarmaq üçün əlimizdən gələni əsirgəməməliyik. 20% torpaqları işğal altında olan bir Vətənin övladları təpədən-dırnağa vətənpərvər olmağa borcludurlar.

Vətənpərvərlik – Vətənə olan ülvi məhəbbətdir. Vətənpərvərlik hissi insanın daxilində olan bir hissdir. Əgər bu hiss sənin daxilində yaranmayıbsa, o zaman nə Vətənini, nə torpağını, nə valideynlərini sevə bilməzsən. Hər bir insan vətənpərvərliyini əməlləri ilə, gördüyü işlərlə sübut etməlidir. Necə ki, Milli Qəhrəmanımız Mübariz İbrahimov daşnak erməniləri qanına-qəltan elədi və Vətəninə olan sevgisini, bağlılığını bir daha göstərdi:

*Bilmədin qorxu nədir sən, ey Türk oğlu,*
*İbrət alsın gərək səndən bütöv bir ordu.*
*Xatırlatdın bizlərə sən yenilməz bozqurdu,*
*Xalqımın mübariz oğlu Mübariz!*

*Ucaldın şəhidlik zirvəsinə, oldun qəhrəman,*
*Hazırıq döyüşə indi biz hər an.*
*Qurban etdin özünü Vətənə gözlərində qan,*
*Xalqımın mübariz oğlu Mübariz!*

*Sən nümunə oldun bizlərə bu gün,*
*Gərək biz də verək düşmənə sənintək zülüm.*
*Allahdan arzumdur sənintək ölüm,*
*Xalqımın mübariz oğlu Mübariz!*

Bu Vətənin suyunu içib, çörəyini yeyiriksə, bu Vətəni göz bəbəyimiz kimi qorumaq hər birimizin borcudur və **İNŞALLAH** biz işğal olmuş torpaqlarımızı mütləq yağı düşməndən azad edəcəyik, Qarabağımıza, gözəl Laçınımıza geri dönəcəyik!

## TƏBRİK

### O yerlərin əsirlik taleyi tezliklə sona yetsin



Adından da bəllidir ki, “Laçın yurdu” jurnalı Laçında yaşamış, ömrünü-gününü o yerlərdə keçirmiş, indi Laçın həsrəti ilə alışıb-yanan insanlar, onların keçmişi, bu günü və gələcəyi haqqında maraqlı yazılara öz səhifələrində mütəmadi yer ayıracaq.

Mətbuat bolluğunda belə bir jurnalı ərsəyə gətirən yaradıcı heyət yəqin ki, üzərlərinə düşən məsuliyyəti də yaxşı anlayırlar. Gənc nəsli maarifləndirmək istiqamətində atılan hər addım həm də orta nəslin borcu və vəzifəsidir.

Bir şair, bir yazar kimi bu yolda Sizə uğurlar diləyir, qatı açılmamış, heç kəs tərəfindən deyilməmiş yeni məlumatları üzə çıxarmağınızı arzulayıram.

Bir yurddaş, bir Vətən oğlu kimi Sizə kömək etmək başlıca amalımız olmalıdır. Laçın adına hörməti olan hər bir vətəndaş harda doğulub boya-başa çatmasından, hansı bölgədə yaşamasından asılı olmayaraq “Laçın yurdu” jurnalına ən azı mənəvi dəstək vermək üçün özündə güc tapmalıdır.

Yaxın gələcəkdə bu jurnalın Laçın dağında, Ərimәzdə, İşıqlıda, Hoçaz dağında - o doğma yerlərdə oxunacağına ümid bəsləyirik. Qoy o yerlərin əsirlik taleyi tezliklə sona yetsin. Bizim bu yurd həsrətimiz, yurd nisgilimiz başa çatsın. Laçınımızda, Qarabağımızda görüşmək arzumuz çin olsun!

**Qəni QƏMLİ**
**(Hüseynov),**
***“Yurd həsrəti” qəzetinin***
***təsisçisi və baş redaktoru***

**ALIN YAZISI**

## ...BU DAĞLARLA POLAD ARTIQ VİDA DİLİ İLƏ DANIŞIRDI

Qarşımda bir kitab var: ***"Bahar ömrün qəm çələngi".*** 2001-ci ildə "QAPP- POLİQRAF" Nəşriyyat-Poliqrafiya Korporasiyasında işıq üzü görən kitabın tərtibçi-müəllifi Sevda Muradxan qızıdır. İlk səhifəsi belə başlanır: *"Yanlış diaqnoz və səhv müalicə üzündən 19 il əlil kreslosuna məhkum olmuş, bu dünyadan nakam getmiş dayım Poladın əziz xatirəsinə və yoxluğunun 10 illiyinə ithaf edirəm."*




Gerçək həyat həqiqətlərini əks etdirən, amansız xəstəliklə mübarizə aparan bir gəncin təzadlarla dolu ömür yoluna güzgü tutan kitabı həyəcansız oxumaq olmur. Bu kitab ilk baxış-dan böyük yazıçımız Qulu Xəlilovun "Yaşamaq istəyirəm" povestini xatırlatsa da, hansısa təkrarçılıqdan söhbət gedə bilməz. Sadəcə olaraq, hər iki əsərin qəhrəmanını oxşar talelər birləşdirir. Əslində isə, bir az dərinə getsək, fərqli talelər daha qabarıq görünər. Əgər "Yaşamaq istəyirəm" nikbin bir sonluqla bitirsə, "Bahar ömrün qəm çələngi" əsərinin Nikbin təxəllüslü qəhrəmanından ürəkləri riqqətə gətirən faciə yan ötmür. Üstəlik faciənin üstünə faciə gəlir: *"Ömrünün əzablı son bir neçə ilini bu keşməkeşli dünyaya göz açdığı, havasına, suyuna, daşına, torpağına bu gün həsrət qaldığımız Laçında yaşadı. Elə bil hər şeyin sona yaxınlaşdığını hiss edirdi. Həmişə böyük qürur hissi ilə tərənnüm etdiyi, gözəlliyindən, vüqarından ilham aldığı bu dağlarla Polad artıq vida dili ilə danışırdı."*

Kitabdan oxuyuruq ki, Poladın əziz xatirəsindən, ürəklərimizdən silinməyən böyük sevgisindən başqa bizə qalan yeganə yadigarı ağrılı-acılı günlərinin şahidi, könlünün əks-sədası, özünün böyük təsəllisi olan yazıları və şeirləridir. Onu heç vaxt tək qoymayan şair dostlarından biri də İsa Mürsəloğlu idi. Hələlik onların "A dağlar" rədifli şeirlərini oxuculara təqdim edir, haqq dünyasına qovuşan hər iki eloğlumuza rəhmət diləyirik. İnşallah, gələcək saylarımızda kitabdan hissələrə geniş yer ayıracağıq.

## A DAĞLAR

***İsa***

Haraya getsəm də tərlan xəyalım
Dönüb zirvələrə qonar, a dağlar.
Yayda yer üstündə seyrə varmasam,
Ürəyim alışıb yanar, a dağlar.

***Polad***

Seyrə çıxıb rast gələndə bulağa,
Könül sellər kimi çağlar, a dağlar.
Dodağım dəyəndə o buz yanağa,
Söndür atəşimi, dağlar, a dağlar.

***İsa***

At belində Nərdivana çıxanda,
Əl uzadıb Gün əlini sıxanda.
Buludlara yuxarıdan baxanda,
Göz özünü ulduz sanar, a dağlar.

***Polad***

Əriməzdə neçə əsrin qarı var,
Zirvəsində Günəş kimi yarı var.
Sizə bel bağlayan yaşar bəxtiyar,
Göylərə veribsiz ilqar, a dağlar.

***İsa***

Kəkliklərin daşlarına qonmasa,
Sızan sular qayaları yonmasa.
Dodaqlarım bulaqlarda donmasa,
Könlüm buz bağlayıb donar, a dağlar.

***Polad***

Külək əssə, ot da sənə qısılar,
Səni görməyənin ömrü qısalar.
Sənin həsrətindən ürək qısılar,
Damcı bulaq kimi ağlar, a dağlar.

***İsa***

Sönən ocaqları qalatmağını,
İnsanı təzədən yaratmağını.
Gödələn bir ömrü uzatmağını
De, hansı insafsız danar, a dağlar.

***Polad***

Təbiblər təbibi, ay ulu loğman,
Keçərdi günlərim gözəl, firavan.
Ömrümə yazılsın yenə o dövran,
Hər dərdin dərmanı dağlar, a dağlar.

***İsa***

Duman olub qəlbilərdən aşmasam,
Sellər kimi dərələrdə daşmasam.
Gündə sizə bir yeni söz qoşmasam,
El-oba İsanı qınar, a dağlar.

***Polad***

Açar qucağını xoşbəxt elinə,
Polad mizrab vurar könül telinə.
Köhlən atla bir də çıxım belinə,
Qoy dolsun sinəmə vüqar, a dağlar.

## NATİQ, TƏŞKİLATÇI, FİLOSOF-MÜƏLLİM

Hər bir millətin kamil müəllimə və məharətli həkimə ehtiyacı var, məharətli həkim insanın fizioloji sağlamlığının loğmanı, zəngin zəkalı müəllim gələcəyimizin, məmləkət və millətimizin ümidi olan kamil insanşünasıdır. Böyük Azərbaycan mütəfəkkiri N.Tusinin mənalandırdığı kimi, "belə müəllim ağıllı, vicdanlı, əxlaq normalarına, uşaq ruhiyyəsinə bələd, şirin danışmaqda, insaflı rəftarda, vüqarlı, nüfuzlu davranışda məşhur, camaatın hər təbəqəsi ilə danışmağı bacaran, rəzil və alçaq adamlardan qaçan olmalıdır. Natiq fəzilətinin məqsədi isə başqalarının bilmədiyini ona öyrətməkdir". Bu kəlam alim-filosof, professor Salman Salahova daha çox yaraşır. O, Laçın rayonu üzrə ilk dəfə əyani universitet qurtaran üç nəfərdən (hüquqşünas Abbas Məmmədov, geoloq Cəlal Nağıyev, Salahov Salman) biridir.



Salman müəllim hələ Laçın şəhər orta məktəbində on il direktor işlədiyi məqamlarda camaatla, qabaqcıl müəllimlərlə əlbir işləyən vaxtlardan ləyaqətli maarif fədaisi kimi tanınırdı. Xatırladaq ki, onun işlədiyi on il müddətində 29 nəfər qızıl və gümüş medallarla məktəbi bitirmiş, respublika ali məktəblərinə Laçından qəbul olunanların sayı xeyli artmışdır. Həmin dövrlərdə mərhum maarif naziri, akademik M.Mehdizadə Laçına gəlmiş, o böyük və gözəl kollektivin işinə yüksək qiymət vermiş, məktəbi təmir etdirmiş və kollektivə nazirliyin xüsusi rəğbətini çatdırmışdır.

Laçın şəhər orta məktəbinin o vaxtkı məzunlarından istedadlı şair-alim Hüseyn Kürdoğlu, Respublika Təhsil Nazirliyində çalışan alim İnqilab Məmmədov, məharətli həkimlər kimi şöhrət qazanmış Nəzakət Tanrıverdiyeva, Ulduz Abbasova, müəllimlik və pedaqoji səriştəsi ilə fərqlənən alim-pedaqoq Malik Mirzəyev, Ulduzə Əhmədova, Yəhya İbadov, Laçın rayon təhsil şöbəsinin sabiq müdiri, təşkilatçı, maarifçi Tofiq Nəcəfov və onlarca başqaları iftixar nümunələridir. Hər il Salman müəllim Bakıya gələr, şagirdlərinin taleləri ilə maraqlanardı.

Sonralar o, elmi işə başlamış və bir yerə 12 nəfərin sənəd verdiyi müsabiqədən uğurla keçərək aspiranturaya qəbul olunmuşdur.

Kənd həyatının vurğunu olan Salman müəllim "Nəsrimizdə Azərbaycan kəndi" mövzusunda dissertasiya müdafiə etmiş, təsərrüfat aləminə vurğun ziyalı kimi Azərbaycan SSR Ali Soveti Rəyasət heyətinə

məsul işə qabağa çəkilmişdir. O, burada 7 il işləmiş və Azərbaycanın bütün rayonlarında, kəndlərində olmuş, məmləkətimizin təsərrüfat və inkişaf imkanlarını, camaatın güzəranını öyrənməyə çalışmışdır. Müəllimlik eşqi ilə yanan Salman Salahov ADPİ-nin (indiki ADPU) fəlsəfə kafedrasına işə qayıtmışdır.

Salman müəllim sözün mübaliğəsiz mənasında peşəkar müəllim olduğunu bir daha təsdiq etmiş və onun bal kimi süzülən hikmətamiz, aydın mühazirələrinin qədirbilənləri, saysız-hesabsız dinləyiciləri olmuşdur. Hətta onun mühazirələrinə qulaq asmağa başqa ali məktəblərin tələbələri də gələrdilər. O, söz kəməndarı, hikmət ustası idi. Onun axıcı, düşündürücü, özünə pərəstiş doğuran yüksək mənimsətmə istiqaməti, şərh üsullarındakı natiqliyi dinləyicini heyran edirdi. Bu məziyyətləri özünə xas səviyyədə daşımağa qadir olan Salman müəllim deyirdi ki, "müəllim gərək elm və həyat haqqında zəngin zəkaya, böyük təcrübəyə, ürəklərə axan şirin dilə malik olsun ki, keyfiyyətli təhsillə səriştəli, əqidəli varis, gənc nəsil yetişdirməyin mahir sükançılığını bacarsın" . O, sözünü işdə göyərtməyə, icra etməyə böyük üstünlük verir və həyatın mənasını məmləkətə yaraşan, millətin gözəl keyfiyyətini yaşadan vətəndaş olmaqda görürdü.

Natiqlik dil pəhləvanlığı olmayıb, əmək qəhrəmanlığı ilə həqiqətə çevriləndə yadda qalır. Salman müəllim qurub-yaratmağın vurğunuydu, onun qənaətinə görə, abadlıq firəvanlıq meyarıdır, yaşıllıq sağlamlıq loğmanıdır. Bu baxımdan o, mətbuatda ardıcıl olaraq səriştəsiz təsərrüfatçılara kömək istiqamətində elmi məqalələr yazırdı. Bu məzmunda yazdığı məqalələrlə əlaqədar rayonların birində rəhbər vəzifəyə getmək təklifi alır. O isə rayonlara rəhbər işə deyil, özünün təbirincə deyilsə, "kainatın təbii gözəlliklər sərgisi, mərdlər məskəni, dünya cənnətinin behişt guşəsi" olan Şəlvə dərəsindəki on bir kəndi birləşdirən sovxoza direktor işləmək arzusunu bildirir və bu arzu qəbul olunur. Salman müəllim əkinçilik və maldarlıq, arıçılıq və bağçılıq təsərrüfatını bilavasitə yaxşı bilməklə bərabər, həm də abadlıq vurğunu idi. O, dərhal bu sovxoza qaradolaq qoyun cinsi, Rusiyadan xüsusi cins düyə gətizdirir. Qabaqtəpə ilə Qovuşuq-Mıxtökən arasında Şəlvə çayının o tay-bu tayı ilə uzanan düzəngahdakı 65 ha sahəyə İsmayıllı və Şəki şitilliklərindən "Qızıl Əhmədi" alma növünün şivlərini əkdirir, habelə Şəlvə dərəsinin meşələrindəki cır alma, armud ağaclarının peyvənd olunmasına nail olur.

Xalqın güzəranı üçün zəruri olan abadlıq işləri aparmaq Salman müəllim üçün ömür məramı olduğundan o, respublikanın iş başında olan xeyirxah adamları ilə işgüzar əlaqə saxlayır, Şəlvə kəndində 400 yerlik

mədəniyyət sarayı, İmanlar, Hacıxanlı, Şəlvə və başqa kəndlərdə dükan, musiqi məktəbi, bazar, peşə məktəbi tikdirir.

Şəlvə dərəsi düzəngahının ortası ilə axan çay, Nərdivan, Dəlidağ, Mıxtökən, Qovuşuq dağlarının sel suları daşanda ətraf kəndlərlə əlaqə tamam kəsilirdi. Bu məqsədlə Salman müəllim aidiyatı təşkilatlarla əlaqə saxlayıb, ətraf kənd sakinlərinin köməyi ilə 8 körpü inşa etdirir.

Ancaq danılmaz həqiqətdir ki, Salman Salahov təsərrüfata nə qədər can yandırsa da, alimliyi daha yüksəkdə dayanmışdı. Ona görə də onun yenidən elm sahəsinə qayıtması, ömrünün sonunadək sevimli peşəsi ilə məşğul olması bütün eloğlularını sevindirmişdir. Çünki Salman müəllimin təbiətində bir mütəfəkkirlik vardı.

Salman müəllim elmi yaradıcılıqdan heç vaxt ayrılmamış, “Ailə və onun mənəvi əsasları” kitabı, 300-dən artıq elmi-publisist məqalələri çapdan çıxmışdır. Onun Nizami, M.Ə.Sabir, C.Məmmədquluzadə, B.Vahabzadə, S.Vurğun və başqa sənətkarlar barədə məqalələri bu gün də sevilə-sevilə oxunur. Salman müəllimin “Fəlsəfi poeziya dühası - Səməd Vurğun” monoqrafiyasında təbiət, cəmiyyət, insan idrakının dialektikası sərrast və dolğun, inkar olunmaz nümunələrlə əsaslandırılır. Monoqrafiyadakı “Kainatın gərdişi və dünyanın dialektikası poeziyada”, “Vətənə vurğunluq və millətə mənəvi qəyyumluğun inikası”, “Ölkələr yanaşı, millətlər qonşu, başçılar olduqda naşı, qalib gələrmi kamal?” , “Dünyanın əşrəfi insan fəlsəfi poeziyanın baş qəhrəmanıdır”, “Zəngin imkanlar zəmnində, miskin güzəran, sərvəti gurluqda taleyi kürlük həqiqətləri poeziyada” adlı və başqa fəsillərdə şairin həqiqətə münasibəti, məmləkətin toxunulmazlığı, millətin firəvanlığı naminə Azərbaycan xalqının misilsiz məziyyətləri öz diyarını dünyaya tanıdan düha Səməd Vurğun qələmində hərtərəfli canlanır.

Salman müəllim “Qeyrət və hünər” adlı roman üzərində də işləyirdi. Amansız ölüm onu sıralarımızdan aparsa da, özündən sonra yaddaşlardan silinməyən xeyirxah əməllər, zamanın bütün anlarında dəyərini itirməyən əsərlər qoyub getdi. Narahat ruhu yağı tapdağında qalan yurdlar üzərində dolaşan filosof alimin ədəbi irsi hələ tam araşdırılmayıb. İnanırıq ki, unudulmaz alimimizin çoxşaxəli yaradıcılığı tədqiqatçıların diqqətindən yayınmayacaq, gənc nəsillərə örnək olan həyat yolu daha dərindən öyrəniləcəkdir.

**Ziyadxan NƏBİBƏYLİ,**
**professor**

**Azər QARAÇƏNLİ**



## "AY LAÇIN..."

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Soruşanda "dünyanın qurtaracağında yaşayırıq" deyərdilər.

And içəndə yüz iyirmi dörd min peyğəmbərə and içərdilər, uşaqlar da gözlərini döyə-döyə böyüklərə baxıb huşa gedərdi və Həsənağa meşəsindən moruq yığmaqdan dönəndə yüz iyirmi dörd min peyğəmbərin goruna and içib söyləyərdilər ki, meşədə canavar görüblər.

Böyüklər uşaqlara inanardı, çünki sözün düzünü uşaqlardan eşitməyə vərdiş eləmişdilər.

Burda həmişə uşaqlara maraqla qulaq asardılar, hər kəs özünə lazım olan sözü uşaqlardan alardı, qonşu qonşunun uşağını danışdıra-danışdıra söz çəkərdi və dünən qab-qacağı divara vurub sındıranın kim olduğunu öyrənərdi.

Ona görə də hamı hər gün öz uşağına öyüd-nəsihət verərdi ki, adam evdə eşitdiyini çöldə-bayırda danışmaz, çöldə-bayırda eşitdiyini evdə danışar.

Sonra sandıqda qorunan qənddandan bir tikə qənd götürüb gizlicə uşağın ovcuna qoyardılar və elə o axşam qonşunun arvadı ərinə deyərdi ki, filankəsin gədəsi yaman bicləşib, bir qırıq boyuyla yerin altını da bilir, üstünü də.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı, hər beş addımda yerin altından bir bulaq qaynayardı, bulaqlar dərə aşağı süzülüb çay qovşağına qovuşardı, dumduru Həkəri çayı axa-axa Araza tökülərdi, Araz Kürə qarışardı, Xəzərə tökülərdi, Xəzərdə şəhərin müsəlman kişiləri, xristian xanımları çimərdi, bu müsəlman kişilər, xristian xanımlar çimərlikdən qayıdıb metroya minəndə yayın cırhacırında altdan-üstdən qıfıllanmış, başına papaq, əyninə pencək geyinmiş iki nəfərin qışqıra-qışqıra nəsə danışdığını görərdilər, əvvəlcə narazı-narazı başlarını bulayardılar, sonra da bir-birilərinə baxıb gülərdilər.

Elə bu vaxt Azərbaycanın qərb sərhədlərinin qurtaracağındakı rayonun mərkəzindən gündə bir dəfə kəndlərə çıxan avtobus dağların enişiylə

uça-uça, yoxuşuyla zarıya-zarıya yol gedərdi, benzin iyi götürməyən arvad-uşağın ürəyi bulanardı, tez-tez maşını saxlayıb havalarını dəyişərdilər, bumbuz bulaqda əl-üzlərini yuyub özlərinə gələrdilər və tikanlı qollarını qayadan uzatmış ağacdan alça dərib dillərinin altına qoyardılar ki, ürəkləri toxtaq olsun.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Burda ancaq avtobusda arvadlar susardı, kişilər danışardı, özü də elə bərkdən danışardılar ki, elə bil bir dağdan o biri dağa hay salıb "Qoyma, mal biçənəyi tapdadı" deyirlər.

Kişilərin səsi arvadların başına düşərdi, başqa vaxtsa kişilər arvadların səsindən baş götürüb qaçardılar.

Həyətlərin birində dama vurulacağı günü gözləyən tirlərin üstündə oturub "Prima"nı tüstülədə-tüstülədə siyasətdən, Stalindən, Mir Cəfər Bağırovdan dəm vurardılar, həftələrlə gecikən qəzetlərdən son xəbərləri oxuyub dünyadan halı olardılar və robotla şahmat oynayan yaponların qüdrətinə məəttəl qalanlara buğda dənəsini qucaqlayıb yuvasına çəkən qarışqanı göstərib başa salardılar ki, Allahdan böyük kişi yoxdu, yaponların qeyrəti çatırsa o robota belə qeyrət, can versinlər.

Allaha, Quran-peyğəmbərə şəkk eləyəndən gen gəzərdilər, amma mollayla da yaxınlıq eləməzdilər.

Məscid tikməzdilər, heç məscidin nə olduğunu bilməzdilər də, öz evlərini Allah evi sayardılar və elə Tanrıya da öz kasıb komalarından tapınardılar.

Ölülərin ruhu yuxularına girəndə mollaya "Yasin" oxutdurardılar, dua, cadu yazdırardılar, amma yenə də mollaya inanmazdılar.

Toyda mollanı araq içməyə dəvət eləyərdilər, yasda mollanın sözünü kəsib yanlışını tutardılar.

Yazıq molla da hər gün namaz qılanda alnını bərk-bərk möhürə basardı, ancaq yenə də camaat söylənərdi ki, namaz qılan rəhmətlik Məşədi İlyas kimi olar, alnında möhürün izi yüz addımlıqdan gözə dəyirdi...

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Camaatı ən çox seldən, ildırımdan, quraqlıqdan, bir də pis gözdən qorxardı.

Ən varlı adamı da dolanışıqdan gileylənərdi, ən sağlamı da canındakı ağrılardan söz açardı və bütün bunları naşükürlükdən yox, bəd nəzərdən qorunmaq üçün eləyərdilər.

Evləri də çöldən ona görə bəzəməzdilər, çəpərlərə də mal kəlləsinin sümüyünü pis gözü sancmaq üçün sancardılar.

Təkcə bostanların çəpəri olardı. Evlərə hasar çəkməzdilər, qapıları gecə-gündüz açıq qoyardılar və təkcə qorxmazlıqdan deyildi bu, həm də mərdlikdən idi.

Ancaq şər qarışanda mal-heyvanı pəyəyə qatıb ağzını qıfıllayardılar ki, oğru aparmasın. Bununla belə, həftə səkkiz-mən doqquz bir oğurluq olardı. Səhərisi mal-heyvanın rəddinə düşüb gedərdilər, kimdənsə şübhələnərdilər.

Sonra da ağsaqqallardan biri "Quran"a əl basıb and içərdi ki, onun oğlunun bundan xəbəri də yoxdu.

Hələm-hələm mal yiyəsi hər ağsaqqalın da "Quran"a əl basmasına razı olmazdı, çünki belədə o, məğlub sayılardı, yersiz şübhəsinə görə gözdən düşə bilərdi və öz halal malını tələb eləmək haqqı bir yana, oğrunun qarasınca deyinmək haqqını da itirərdi.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Həyat qışda qurtarardı, yayda başlayardı. Adamları yaşamaqdan, arıları bal yığmaqdan, çiçəkləri rəng alıb rəng verməkdən doymazdı.

Yas düşməsə yay uzunu şənlik olardı, şenlik olardı.

Toyda nəlbəkiləri maşının təkərinə çırpıb sındırardılar, gəlini ata mindirib tərkinə də bir oğlan uşağı oturdardılar, maqnitofonu qoşub oynayardılar, saz çalıb oxuyardılar, cıdıra çıxıb at çapardılar.

Birinci yerə çıxan atın boynuna qırmızı şal bağlayardılar, yiyəsinin cibinə pul basardılar.

Birisi də ata qiymət kəsərdi, əlini kəhərin yalmanına çəkib “Denən Allah xeyir versin” deyərdi. Ancaq elə o gün yüz-yüz vuran və aldığı nəməri dominoda tay-tuşlarına uduzan at yiyəsi ayağa durmaq istəyəndə yol ayağının altından qaçardı, birdən yadına düşərdi ki, günortaüstü də gözü beləcə ayağının altını görmürdü, bircə onu görürdü ki, ondan irəlidə bir kənd var və kəhər madyan bir atı da o kəndə gedən yolda özündən irəli buraxmayıb.

Kövrələrdi, bu dünyada kəhər madyan ona hər şeydən əziz gələrdi, özünü qınayardı ki, gör necə axmaq olmuşam, kəhəri itin-qurdun əlinə verməyə razılaşmışam.

Hirs vurardı başına, hay salıb uşaqlardan birini çağırardı, tapşırardı ki, gedin filankəsə deyin, heç dədəm də gəlsə kəhəri satmaram, bir torba qızıla da dəyişmərəm kəhəri.

Onu sakitləşdirmək istəyərdilər, soyuq suyu başından əndərərdilər, osa ayağını yerə çırpa-çırpa “Kopoyoğluyam kəhəri satsam, at kişinin qeyrətidi” bağırıb hıçqırardı.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Kişiləri bir gün ot çalardı, iki gün mütəkkəyə dirsəklənib qulunclarının ağrısını çıxarardı.

Arvadlar səhər ot yığardı, günorta evə qaçıb odun doğrayardı, çörək bişirərdi, axşam inəkləri sağardı, sonra da uşaqlarının üstünə çığırardı ki, dinməz durun, dədəniz yorğundu, qoyun dincəlsin...

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Kişiləri bir-biriylə dalaşan kimi söz-söhbət yayılardı ki, bunları arvadlar öyrədib.

Vay o günə ki, arvadlardan biri yad qızı olaydı, yad qızı deyəndə ki, ərinə əmiqızı, xalaqızı, dayıqızı kimi yox, bir başqa cür qohumluğu çataydı.

O dəqiqə qayınanası gedib oturardı qonşuda ki, bəs sümüyümü it sümüyünə calayıblar, ay el-oba!..

Qonşular da "can-can" deyə-deyə ona bir stəkan su içizdirərdilər, bununla da odun üstünə benzin töküb geri yollayardılar.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Orda gəlinlərlə qayınanalar səhər-axşam bir-birini qırardılar. Evdə subay oğlan olanda qayınananın gəlinlə düşmənçiliyi lap artardı.

Çünki hər qayınanaya elə gələrdi ki, gəlini onun subay oğluna öz qohumlarından birini almaq istəyir.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı.

Orda subay oğlan olmaqdan gözəl heç nə yox idi. Hansı qapıya gedərdin, altına döşək sərərdilər. Hansı ananın halını soruşardın, o dəqiqə nə dərdi-səri vardısa açıb tökərdi.

Özü də elə pıçapıçla danışardı ki, elə bil bu dünyada ona səndən yaxın, səndən doğma adam yoxdu.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağındakı rayonda subay olmaqdan gözəl heç nə yox idi. Ot yığmağa gedən qızların maşınların kuzovunda yanından ötüb-keçməsi gözəl idi.

Səhəngini götürüb bulaq başına yığışan qızların səni görəndə kiriməsi gözəl idi. Kəndin bütün evlərindən görünən Qara ağac düzündə at çapmaq, hər bazar günü hind kinosu gələndə məktəbin artırmasında yer tutmaq uğrunda çarpışmaq...

Gözəl idi. Ay nədi ki, ayın batması da gözəl idi, gün nədi ki, günün çıxması da gözəl idi.

Çünki bu, eləcə ayın batması, günün çıxması deyildi. Bu, həyat idi və bu həyatda yaşamağın gözəlliyi idi.

Azərbaycanın qərb sərhədlərinin qurtaracağında bir rayon vardı... O rayon indi yoxdu. İşğal da elə budu.

## BİR ÇİÇƏK DƏ VƏTƏNDİR

2005-ci ildə Gəncədə "Xalq ozanı" qəzetinin redaksiyasında Sədnik Paşa Pirsultanlı ilə görüşdük. Həmişə olduğu kimi bu dəfə də ayrılarkən mənə iki kitab verdi. Kitabın birinin adı diqqətimi daha çox çəkdi - "Bir çiçək də Vətəndir". Pərən-pərən düşən bir milyondan artıq qaçqının, köç-künün cərgəsində olduğum üçün bu ad məni çox düşündürdü:


*Səyyah Məhəmməd*

- Doğrudanmı bir çiçək də Vətəndir? Bu boyda Vətən torpağını bir çiçəkmi əvəz edəcək?

Kitabı oxumaqla doymurdum, amma adı ilə də barışmırdım.

Saatları günlər, günləri həftələr, həftələri aylar, ayları isə illər tamamladı. 2007-ci il dekabrın 5-i idi. Borçalıda, Azərbaycan Mədəniyyət Mərkəzində Leyla xanım (Leyla xanım o vaxt mənə dərs deyirdi) məni Dərviş Osmanla tanış etdi. Bu tanışlıqdan artıq dördüncü yazımdır. Yenə də o tanışlıqdan yazmasam yazının əsasına keçə bilmirəm. O gün 15 dəqiqəlik söhbətində atası Əhməd babanın Laçına, oradan da Həmzə bulağına gedərkən yolda Səyyah Məhəmmədlə görüşməsindən, üstəlik şairin üç bəndlik bu şeiri Laçından Borçalıya - Osmana göndərməsindən danışmışdı həmsöhbətim:

### GƏLMİŞƏM

Əmi, bu gülləri yetir Osmana,
Söylə ki, dağlardan dərib gəlmişəm.
Qəfil ürcah oldum Səyyah qardaşa,
Ellərini gəzib-görüb gəlmişəm.

Həmzə bulağına bir yerdə getdik,
Üstə çörək kəsdik, çox şükür etdik.
Şəfalı suyundan doldurub gətdik,
Qardaşın qəlbini hörüb gəlmişəm.

Dönüb süfrəsində kəsdim də çörək,
Allah qismət etsin bir yerdə gedək.
Səyyaha Osmantək qardaşı gərək,
Ayrılcaq halallıq verib gəlmişəm.

***18 avqust 1970-ci il***

Osman əmi 40 il əvvəlki dostundan danışanda oradaca dostunun taleyindən, övladlarından xəbər gətirəcəyimə söz verdim.

O şeirin, o gülün indi də durduğunu söyləyəndə - Osman müəllim, o gülün bir dənəsini də siz mənə verin, - dedim. Söhbətimiz bununla da yekunlaşdı. Osman müəllim hönkür-hönkür ağladı...

Tələbə kimi qaldığım evə gələndə  bu halımı görən otaq yoldaşım Rəşad Seyidzadə təəccübləndi:

- Sənə nə olub, qardaş?!

Başıma gələnləri danışdıqdan sonra hər ikimiz Osman əminin yanına qayıtdıq. O, üzünü Rəşada tutub:

- Ə, nə isteyersiniz , məni öldrejəksinizmi? - dedi.

Mənim təzədən Osman əminin yanına getməyə gücüm yetmədi, ərkim qələmə çatdı. Bu şeiri yazıb Rəşadla ona göndərdim:

**DƏDƏ**

Talandı torpağım, talan olmuşam,
Od tutub, alışıb yanan olmuşam.
Vətəndə vətənsiz qalan olmuşam,
Ağlaram, hər zaman ağlaram, dədə.

O dağlardan məndə bircə yadigar,
Kədəri var, nisgili var, qəmi var.
Özün dedin: "Məndə Laçın gülü var,
Versən o gülləri qoxlaram, dədə.

Neynim, tabım yoxdu dərdə dözməyə,
Yolum düşmür Çalbayırda gəzməyə.
Öləndə qəbrimin üstə düzməyə
Alıb o çiçəyi saxlaram, dədə.

Dərviş Osman, bu taleyə nə deyim,
Zəmanədən yaman çoxdur gileyim.
Bəlkə bir az sakitləşər ürəyim,
Baxıb o çiçəyə ağlaram, dədə.

On beş ildi göz yaşımız sel olub,
Bağımız talanıb, gülümüz solub.
Köçkünəm, bir çiçək təsəllim olub,
Saxlaram, əbədi saxlaram, dədə.

**DAĞLARA**

Dədə Osman, gör nə günə qalmışam,
Səsim çatmır, ünüm yetmir dağlara.
Göz yaşım qəlbimə leysantək yağır,
Səsim çatmır, ünüm yetmir dağlara.

Qantəpər, kəkotu düşür yadıma,
Hansı tam tay olar çaşır dadına?
Tamarzı qalmışam unnucasına,
Səsim çatmır, ünüm yetmir dağlara.

Yəqin taleyimiz kəm gətiribdi,
Köçkünəm, qəlbimi həsrət didibdi.
Qoyulub qumara, qurban gedibdi,
Səsim çatmır, ünüm yetmir dağlara.

...Hey düşünürdüm: “Görəsən, Sədnik Paşayevə desəydim ki, Paşam, niyə kitabın adını “Bir çiçək də Vətəndir” qoymusan məni bağışlayardımı?!

Bu misralar mənə nələr demirdi, İlahi!...

Bir çiçək də Vətəndi,
Bir ləçək də Vətəndi.
Bir budaq da Vətəndi...

...Qurban olum bir yanı Dərbənd Vətənə,
Qurban olum
Bir yanı qürbət Vətənə...

Bəli, Paşam, bir çiçək də Vətəndir...

Osman müəllim hər məni görəndə - Səyyahı axtar və haqqında kitab yaz - deyirdi.

Çox şükürlər olsun ki, şairin nəsil şəcərəsi davam edir, mən də Səyyahın şeirlər kitabını çapa hazırlayıram.

40 il əvvəl Laçından gələn bir dəstə çiçək göyərməyə başlayıb, amma nisgilli Laçınım, qərib Səyyahım deyir, Osman əminin evindən üzü Laçına tərəf boylanır... Boylanır ki, görəsən Laçına el nə zaman qayıdır?... Boylanır ki, elat Borçalıdan Həmzə bulağına nə vaxt gedir?... Boylanır ki, kim Həmzə bulağından bir damcı su gətirib yanğısını söndürəcək... Boylanır ki, bəlkə Səyyahım gəldi... Boylanır ki, Səyyah Məhəmmədlə Dərviş Osman dostluğunu Məhəmməd Köçkünlə Dərviş Osman necə davam etdirəcək...

Boylanır ki...

**Məhəmməd AĞALAROV,**
***Laçın rayonu, Oğuldərə kənd***
***orta məktəbinin dil-ədəbiyyat müəllimi***

**Hörmətli oxucular!**

*Məhəmməd Səyyahın şeirlərini və onunla bağlı xatirələri nəşr etdirmək təşəbbüsü irəli sürülüb. Bu səbəbdən şairin tələbə yoldaşlarına, keçmiş şagirdlərinə, qələm dostlarına, şeirlərini bilən, xatirəsi olan hər kəsə üz tutaraq "Laçın yurdu" jurnalı vasitəsilə bizimlə əlaqə saxlamağı xahiş edirık. Yazılarınızı bu ünvana da göndərə bilərsiniz;*

**e-mail:** mehemmedkockun@box.az



**Nicat RÜSTƏMLİ**



## CƏNNƏTDƏN MƏKTUB

Salam Azərbaycan övladı! Deyəsən məni tanımadın. Bir azdan tanıyarsan. Necəsən deməyəcəm. Çünki necə olduğunu görürəm. Kefdəsən, hər gün konsert, əcnəbi qonaqlar, milli şou-biznes, əyləncə. Bu zəmanə üçün hər nə istəsən var. Mənim də yerim pis deyil, ancaq fərqimiz böyükdür! Mən bu yerə özüm sahib olmuşam. Çox əziyyət çəkmişəm!

Mən indi sizin aranızda yoxam. Köçmüşəm başqa bir ölkəyə. Bura çox xoşuma gəlir. Burada hər şey ədalətlə ölçülür. Nə nemət desən var burda. Mən sizin halınıza acıyıram. Bilirsiniz niyə? Çünki mən istəyirdim ki, mənim millətimin övladı müəyyən müddətdən sonra bura gəlsin. Ancaq belə baxıram ki, siz bura gəlməyəcəksiniz.

Mən bu məktubu təkcə öz adımdan yox, mənim kimi bu ölkədə yaşayan minlərlə azərbaycanlıların adından yazıram. Mənim sözlərim onların da sözləridir. Hər şeyi yazacağam. Avropalaşmısınız artıq. Bunu biz demirik. İndi zəmanənin televiziyası, geyimi, əqidəsi, davranışı göstərir ki, milli mentalitetdən əsər-əlamət qalmayıb. Niyə?

Siz gəncsiniz. Bu millətin, bu dövlətin, bu xalqın, bu ölkənin ümidi sizlərədir. Gələcək siz gənclərin əlindədir. Ancaq diqqətlə baxın və düşünün. Siz gələcək üçün nə edirsiniz?

Mən artıq 19 ildir ki, Azərbaycanda yoxam, qayıtmağa da imkanım yoxdur. Ancaq ölkəmizin daxilində və xaricində baş verən hadisələrdən xəbərdaram. Ramil Səfərov yadıma düşdü, kövrəldim. O, ömrünün axırınadək qazamatda yatacaq bir insan deyildi. Biz əlimizdən gələni etdik, ancaq burda bizə dedilər ki, qarışmayın. Siz artıq o ölkənin vətəndaşları deyilsiniz. Qoy Ramili azərbaycanlılar qorusun, - dedilər. Nəticədən utandıq. Ramil qardaş ömürlük həbs cəzasına məhkum olundu.

Hansını deyim, hansını danışım?

Niyə unutqansınız? Niyə hər şeyi belə tez unudursunuz? Çingiz Mustafayevin belə bir sözü var idi. "Heç kim və heç nə unudulmayacaq!" Təəssüf ki, bu belə olmadı. Siz çox unutqan oldunuz! Sizlər 2 saatlıq gələn sel kimisiniz. Bir xəbər eşidəndə dərhal reaksiya verirsiniz. Çox az bir müddət keçəndın sonra heç elə bil belə bir şey olmayıbmış kimi hər şeyi rahatlıqla unudursunuz. Bizi də unutmusunuz. Biz isə sizləri unutmuruq. Nə sizi, nə Azərbaycan xalqının başına açılan oyunları, nə də ki minlərlə günahsız öldürülən insanları.

Dua edirsiniz: “Allah bizə səbr ver, Azərbaycan xalqına səbr ver”. Bəlkə səbr diləmək artıq kifayətdir? Bəlkə Allahdan bir az güc istəyəsiniz? Milli ideologiya deyilən bir şey var. Bu sizdə yox dərəcəsindədir. Millət daim parçalanır. Hərənin bir səmti var, birlik yoxdur. Bir olun, şəhidləri unutmayın. Onlar gələcək üçün öz canlarını fəda etdilər. Siz rahat yaşaya biləsiniz deyə öz canlarını qurban verdilər.

İndi sizin üçün çox maraqlıdır ki, bu məktub hardan gəlib, kimdən gəlib? Bəlkə də artıq başa düşdünüz.

**İmza: ŞƏHİD**

## ELDƏN-ELƏ, DİLDƏN-DİLƏ

## HİDAYƏT VƏ LAÇIN EYVAZ

Onlar XIX əsrin sonu, XX əsrin əvvəllərində Laçın rayonunun dilbər guşələrindən olan, 11 kəndi (Şəlvə, Hacıxanlı, İmanlar, Qovuşuq, Budaqdərə, Daşlı, Vəlibəyli, Narışlar, Hətəmlər, Kaha və Dambulaq) əhatə edən Şəlvə dərəsində, rayonun şimalında Kəlbəcər rayonu ilə həmsərhəd, dəniz səviyəsindən 1500-2000 m yüksəklikdə yerləşən, cənnəti xatırladan səfalı bir bölgədə yaşamışlar. Öz kəndləri Hacıxanlı olmuşdur.

Onların igidliyindən Şəlvə dərəsində hamı danışırdı. Eyvaza bir çox qeyri-adi bacarıqlarına görə “Laçın” ləqəbi də vermişlər. O, hətta ovu silahsız qovub tuta bilirmiş.

Onlar rəhmətlik atamın (Piralı kişinin) dayıları olub.

Uşaq vaxtlarımda rəhmətlik Qumru nənəm onlar barəsində mənə əfsanəyə bənzər çox hekayətlər danışardı:

**Hidayət**

Xalq qəhrəmanımız Koroğluya bənzər nəhəng gövdəli, uca boylu, eşmə bığlı bir kişi olub. O vaxt-sovet hökuməti təzə qurulanda onları qəbul etməyib. Kərbəlayi kimi deyib ki, “Mən kolxoz ola bilmərəm, mənim öz binəm, öz kolxozum var”.

Onu həbs edib Şuşa qalasında türməyə salırlar, əl-ayağını qandallayırlar. Ancaq o həmin gecə qandalları sındırıb, türməni dağıdır və Hacıxanlıya qaçıb gəlir.

Qərara gəlir ki, köçüb getsin Dərələyəzə - dayılarının yanına. Lakin onun köçü kənddən uzaqlaşmamış hökumətin göndərdiyi dəstə düşür dallarınca. Möhkəm atışma olur. Hidayət onları geri oturdur, qovub kənddən çıxarır və deyir: “Mən özüm çıxıb gedirdim, siz mane oldunuz, indi isə heç getmirəm.”

Bir neçə gündən sonra hökumət tərəfindən əlavə dəstə göndərilir, yatdığı yerdə Hidayəti tuturlar. Onu aparanda son söz kimi deyir: ”Camaat, yoldaşımın bətnində uşağı var, bax sonra söz-söhbət yaradarsız. Oğlum olsa adını Mamed qoyarsınız... Qızım olsa, deyə - göylərə baxır... Sifətinə çiləyən xırda yağışamı, yoxsa doğulacaq qızınamı Narın deyir.

Onu aparanda heç bir at götürə bilməyib, axırda öz atını - Sarı Madyanı tapıb gətirirlər.

**Laçın Eyvaz**

Laçın Eyvaz yaylaqda bir neçə çobanla mərcləşərək hər qoltuğuna bir qoyun götürür və dağ yuxarı qaçırır. Çobanlar itlərini nə qədər fısqırsalar da itlər daldan ona çata bilmirlər. Çobanlar mərcin şərtinə əsasən qoyunları Eyvaza halal edirlər.

Eyvazın dayıları Dərələyəzdə yaşayırlarmış. Eyvaz da gənc yaşlarında, yaz-yay aylarında Dəlidağı keçib gedər, dayılarına dəyərmiş. Elə olur ki, Eyvaz Dərələyəzdə Sənəm adlı bir qıza vurulur, sevgisi də qarşılıqlı olur. Sənəm də 7 qardaşın bir istəkli bacısı imiş. Odur ki, qardaşlar bacılarını uzaq, yad yerə vermək istəmirlər, qətiyyətlə etiraz edirlər. Lakin Eyvaz istəyindən dönmür. Payız vaxtı qızla gizlin görüşür, əhdi-peyman bağlayır, yazda qayıdacağına söz verərək Laçına- Şəlvə dərəsinə qayıdır.

O qış Eyvaz üçün çox darıxdırıcı keçir. Artıq mart ayı girəndə səfərə hazırlaşır. Nə qədər təkid edirlərsə də, onu yoldan qaytara bilmirlər. Dağların qarı əriməmiş Dəlidağdan aşaraq Dərələyəzə-dayılarını və Sənəmi görməyə gedir. Amma bu gözlənilməz qonaq Dərələyəz cavanlarının heç xoşuna gəlmir, çünki gözəl Sənəmi istəyənlər çox idi.

Novruz bayramında Dərələyəzə adlı-sanlı bir pəhləvan gəlir. Rəqibləri Eyvazı sındırmaq üçün bayram şənliyində onu təkidlə pəhləvanla qarşılaşdırırlar. Pəhləvan Eyvazı götürüb tullayır, ancaq Eyvaz ayaq üstə yerə düşür. Bu zaman pəhləvan şığıyıb yenə də onunla tutaşır. Birdən Sənəmin həyəcanlı səsi eşidilir: - Eyvaz!!! Ürəyinə təpər verən bu səsdən güc alan Eyvaz dağ gövdəli, özündən təxminən iki dəfə ağır Qara pəhləvanı başı üzərinə qaldıraraq arxası üstə yerə sərir.

Bir gün kənddə toy olur. Hamı toyda olanda Eyvaz fürsətdən istifadə edib Sənəmin görüşünə gedir. O, evdə tək imiş. Eyvazı izləyənlər bu xəbəri toydakılara çatdırırlar. Bunu eşidən kənd camaatı gəlib evi dövrəyə alırlar, Sənəm bərk qorxur. Eyvaz ona deyir ki, mən çölə çıxanda sən qapını arxadan bağla. Qardaşların çox hirsli olduqları üçün səni öldürə bilərlər. Eyvaz çölə çıxan kimi bir göz qırpımında hamının başı üzərindən tullanaraq qaçır. Ona çata bilməyəcəklərini görən kənd camaatı atla-

nıb düşürlər Eyvazın arxasınca. O vaxt Arpa çayı bərk daşmışdı. Onlar Eyvazın hər tərəfini kəsib çaya doğru yönəldirlər ki, ya onu tutsunlar, ya da sellər aparsın. Ancaq elə olmur. Çünki möcüzəli bir sıçrayışla Eyvaz çayı tullanır, atlılar çayı keçə bilmirlər. Onlar çayın bu tayından, Eyvaz isə çayın o tayından bir-birinə baxırlar. Bu zaman Eyvazın dayıları da gəlib çıxırlar. Onlar Eyvazın hayına gəlmişdilər. Bu səhnənin şahidi olan Sənəmin kiçik qardaşı deyir ki, Eyvaz ki, belə bir igid oğlandır, mən öz payıma bacımı ona halal edirəm. O biri 6 qardaş da deyirlər ki, Sənəmi Eyvaza verəcəklər.



Dayıları bu şad xəbəri Eyvaza çatdırırlar və iki gün çay boyu gedərək körpüyə çatacağını və ordan keçıb kəndə qayıda biləcəyini bildirirlər. Eyvaz isə çayı tullanacağını bildirir. Dayıları çağırıb deyirlər ki, bu çayı keçmək olmaz, bayaq sən qorxudan o boyda tullanmısan. Eyvaz isə : - Bayaq qorxudan, indi isə Sənəmin eşqinə” - deyib Arpa çayından təkrar tullanır.

**Dilafət RƏSULOV**



***Ağoğlan məbədi***

# TƏSİSÇİDƏN ZƏRURİ QEYDLƏR

Əziz oxucular, jurnal çap olunduqdan sonra bizə tutulacaq iradları bəribaşdan proqnozlaşdırırıq və təbii sayırıq.

Eyni zamanda hədəflərimizi bölüşməyi də özümüzə borc bilirik. Heç vaxt yalnız məşhur insanlardan yazmağı qarşımıza məqsəd qoymamışıq. Qapılarımızı kiminsə üzünə qapayacağımızla bağlı da üzərimizə öhdəlik götürməmişik. Amalımız jurnalı tariximizə güzgü tutan, araşdırmalar aparan, ziyalılarımızı, ağsaqqallarımızı, yaddaşlarımızda yaşayan dəyərli şəxsiyyətlərimizi gənc nəslə tanıtmaqda maraqlı olan qələm sahiblərinin tribunasına çevirməkdir.

Danılmaz gerçəklikdir ki, həqiqət mübahisələrdə, müzakirələrdə üzə çıxır. Təəssüflə qeyd etməliyik ki, hərdən xoşagəlməz situasiyalarla rastlaşırıq. Belə ki, doğma Laçınımıza aid bir kitab, toplu işıq üzü görən kimi bu xeyirxah təşəbbüsü alqışlamaq əvəzinə, küncdə-bucaqda, çayxanalarda, xeyirdə-şərdə daha çox giley-güzar eşidirik. Gah hansısa faktın təhrif olunduğunu, kiminsə barəsində yazılanların şişirdildiyini və yaxud kiçildildiyini söyləyənlər tapılır. Unutmayaq ki, ayrı-ayrı fərdlərin fərqli fikirləri başa düşüləndir və haqlı iradların səslənməsinə də etirazımız yoxdur. Ancaq gəlin birlikdə mövcud vəziyyətə diqqət yetirək. Elə hallar olur ki, tariximizi mükəmməl bilən soydaşlarımız malik olduqları zəngin məlumatları ictimailəşdirməyə həvəs göstərmirlər. Bir qrup soydaşlarımız isə əksinə, ən adi bilgilərini belə hamıya çatdırmaqda maraqlıdırlar. Nəticədə fəallığı ilə seçilən qrup mətbuatla sıx əlaqələr quraraq öz mövqelərini cəmiyyətdə möhkəmləndirirlər.

Başlanğıc həmişə çətin olur. Çətinliklərdən keçmək üçün ilk növbədə səmimiliyimizə arxalanmışıq. Heç vaxt səhvlərimizi etiraf etməkdən və düzəltməkdən çəkinməyəcəyik. İlk sayımızda təqdimata daha çox haqqı olanların hamısı haqqında məlumat toplaya bilmədik. Bəzən də məlumatların düzgünlüyünə tam əmin olmadığımızdan həmin yazıları jurnalda yerləşdirmədik. Hərdən laqeydliklə də üzləşdik. Əvvəlcə rəhbərlik etdiyi şöbənin fəaliyyətini işıqlandırmağa razılıq verib, sonra sözünün üstündən qaçan məmur da tapıldı. Halbuki biz o şöbənin qapısını xoş niyyətlə açmışdıq, məqsədimiz görülən işlərlə bağlı rayon ictimaiyyətini məlumatlandırmaq idi. Ümumiyyətlə, qələmimiz yalnız saf arzulara xidmət göstərəcək. Qəlbimizdə qərəzə zərrə qədər də yer tapılmayacaq. Yetər ki, bizə etibar edəsiniz, sevincinizi, kədərinizi “Laçın yurdu” ilə bölüşəsiniz. Ürəyinizi boşaltmağa, sözünüzü deməyə ünvan tapmayanda mütləq bizə üz tutun. Bu jurnal sizin kürsünüzdür, kürsünüzü heç vaxt boş qoymayın.

## UNUTMA!

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib.

İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür.

Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.

| | |
|---|---|
| 1.Xocavənd | 18.02.1992 |
| 2.Xocalı | 26.02.1992 |
| 3.Şuşa | 08.05.1992 |
| 4.Laçın | 17-18.05.1992 |
| 5.Kəlbəcər | 03-06.04.1993 |
| 6.Ağdərə | 17.06.1993 |
| 7.Ağdam | 23.07.1993 |
| 8.Cəbrayıl | 18.08.1993 |
| 9.Füzuli | 23.08.1993 |
| 10.Qubadlı | 30-31.08.1993 |
| 11.Zəngilan | 29-30.10.1993 |

